## BU NÖMRƏDƏ

**LİSENZİYA № 022589**

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 496-74-20; 496-74-19**

**Redaksiyanın ünvanı: Bakı ş., Afiyəddin Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, 409, 410 və 411-ci otaqlar). İndeks AZ 1025 Kağız formatı 70x108 1/16 Sifariş:**

**Jurnal redaksiyanın kompyuter mərkəzində yığılıb səhifələnmiş, "Ərgünəş" FM-də (nəşriyyat-poliqrafiya müəssisəsində) çap olunmuşdur.**

## В этом номере



## In this number

# TƏHSİL DÖVLƏT SİYASƏTİNİN PRİORİTETLƏRİ SIRASINDA İLK YERLƏRDƏN BİRİNİ TUTUR



**MİKAYIL CABBAROV,**
**Azərbaycan Respublikasının təhsil naziri**

Son illərdə ölkə Prezidenti cənab İlham Əliyevin həyata keçirdiyi düşünülmüş və uzaqgörən siyasət sosial həyatımızın bütün sahələrinin, o cümlədən elm və təhsilin tərəqqisinə güclü təkan verib. Bu bir reallıqdır ki, müasir dövrdə ölkələrin tərəqqisi elm və təhsilin inkişafı ilə birbaşa bağlıdır. Dünya təcrübəsi göstərir ki, istənilən dövlətin inkişaf səviyyəsini ölkənin təbii sərvətlərinin bolluğu deyil, bu sərvətlərin yüksək potensiala malik insan kapitalına çevrilməsi, bilik iqtisadiyyatının formalaşması müəyyən edir.

2015-ci ilin başlanğıcında ölkə təhsili üçün uğurlu oldu. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sərəncamları ilə "Dövlət ümumi təhsil müəssisələrində çalışan, bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsi aparılan müəllimlərin dərs yükünün və əməkhaqqının artırılması haqqında" və "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı"nın təsdiq olunması bu baxımdan xüsusilə mühüm əhəmiyyətə malikdir.

Ölkə başçısının təhsilə, təhsil ictima-

iyyətinə hər zaman göstərdiyi həssas münasibət baxımından dövlət ümumi təhsil müəssisələrində çalışan, bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsi aparılan müəllimlərin dərs yükünün və əməkhaqqının artırılması böyük qayğının nəticəsi idi. Region ölkələrində büdcənin sosial xərclərinin azaldıldığı və dünya bazarında neftin qiymətinin endiyi bir vaxtda belə bir qərarın verilməsi, əlbəttə ki, gözlənilməz oldu. Bu, bizim üçün - təhsil işçiləri üçün böyük bir hədiyyə olmaqla yanaşı, eyni zamanda, təhsil ictimaiyyətinin üzərinə böyük məsuliyyət qoyur.

Ölkə Prezidentinin "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı"nın təsdiq edilməsi haqqında 19 yanvar 2015-ci il tarixli sərəncamı bu ilin təhsil sisteminin inkişafı baxımından dönüş ili olacağını deməyə əsas verir. Dövlət Strategiyasının Fəaliyyət Planında təhsilin bütün pillə və səviyyələri üzrə gələcək tədbirlərin icrası ilə bağlı dəqiq və əhatəli istiqamətlər əksini tapıb.

İlk növbədə qeyd etməliyik ki, təhsil sistemində keyfiyyətin yüksəldilməsi, kadr potensialının səriştə və kompetensiya baxımından gücləndirilməsi, şəffaflığın təmin edilməsi, müasir idarəetmə modelinin tətbiqi və digər istiqamətlər üzrə islahatların intensivləşdirilməsi məqsədlərinə xidmət edən bu qərar bir daha dövlət siyasətinin prioritetlərini və ölkə rəhbərinin təhsilə olan xüsusi qayğısını əks etdirir. Təsadüfi deyil ki, cənab İlham Əliyev üçüncü dəfə ölkə Prezidenti seçiləndən sonra imzaladığı ilk sənədlərdən biri "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" olub.

2014-cü ildə təhsil sahəsində islahatlar və tədbirlər uğurla davam etdirilib. Azərbaycanın müstəqillik illərində aktual sahə kimi yanaşılan məktəbəqədər təhsilə dövlət tərəfindən xüsusi diqqət və qayğı göstərilir. Məktəbəqədər təhsil sahəsində mövcud olan problemlərin aradan qaldırılması, təhsilin müasir tələblər səviyyəsində qurulmasının təmin olunması istiqamətində kompleks tədbirlər yerinə yetirilir.

Dövlət məktəbəqədər təhsil müəssisələri şəbəkəsinin genişləndirilməsi ilə yanaşı, özəl sektorun da bu sahədəki inkişafı böyük əhəmiyyət kəsb edir. Yeni qəbul olunmuş "Körpələr evlərinə, körpələr evi-uşaq bağçalarına, uşaq bağçalarına, xüsusi uşaq bağçalarına və uşaq evlərinə müddətli vergi güzəştlərinin verilməsi haqqında" qanuna əsasən 2014-cü il yanvarın 1-dən başlayaraq 10 il müddətinə məktəbəqədər təhsil müəssisələri Vergi Məcəlləsi ilə müəyyən edilmiş hüquqi şəxslərin mənfəət vergisini və sadələşdirilmiş vergini ödəməkdən azad ediliblər. Bu isə uşaqların intellektual, fiziki və psixoloji inkişafı üçün lazımi şəraitin yaradılması ilə yanaşı, bu sahənin inkişafının təkcə dövlət sərmayələri ilə deyil, həmçinin özəl sektorun iştirakının stimullaşdırılması yolu ilə təmin etmək məqsədi daşıyır.

Dövlət Strategiyasında ölkə üzrə azyaşlı uşaqların məktəbəqədər təhsilə cəlbolunma səviyyəsinin orta Avropa göstəricisi səviyyəsinə çatdırılması əsas məqsəd kimi qoyulur. Buna nail olmaq üçün isə məktəbəqədər təhsil müəssisələri şəbəkəsinin genişləndirilməsi, onların şərait və təchizatının yaxşılaşdırılması, habelə bu sahədə müxtəlif tipli, məsələn, icma və ailə tipli müəssisələrin yaradılmasına xüsusi önəm verilir.

Təhsil Nazirliyi tərəfindən ümumi təhsil məktəblərində məktəbəhazırlıq qruplarının yaradılması üçün tədbirlər görülür. Paytaxtın 89 ümumi təhsil müəssisəsində məktəbəqədər hazırlıq qrupları fəaliyyətə başlayıb. Bu qruplar uşaqların tədrisə hazırlıqlı başlaması və ilkin bilikləri əldə etməsi məqsədlərinə xidmət edir. Bu qruplara cəlb edilən uşaqların vaxtından əvvəl I sinfə mü-

sahibəsiz qəbul olunması barədə qərar qəbul olunub.

Dövlət Strategiyasında eyni zamanda, məktəbəqədər təhsil üzrə kurikulumun tətbiqinin sürətləndirilməsi zəruri hesab edilir. Kurikuluma əsasən məktəbəqədər təhsil uşağın ətraf aləmlə harmoniyasını təmin etməyə, xeyirxah hislər oyatmağa, əməkdaşlığa və müsbət özünütəsdiqə nail olmaq baxımından əhəmiyyətlidir.

“Məktəbəqədər təhsilin proqramı (kurikulumu)”nın pilot qaydasında tətbiqi məqsədilə respublikanın 15 pilot şəhər və rayonunda məktəbəqədər təhsil müəssisələrinin pedaqoji işçiləri üçün təlimlər keçirilib. Bu təlimlərdən 3093 tərbiyəçi keçib. Bu il təlimlərin bütün məktəbəqədər təhsil müəssisələrinin pedaqoji işçiləri üçün təşkil olunması nəzərdə tutulur.

Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti Mehriban Əliyevanın rəhbərliyi ilə fond yeni layihəyə - məktəbəqədər təhsil müəssisələrinin inkişafı proqramına start verib. Proqramda ölkə üzrə məktəbəqədər təhsil müəssisələrinin genişmiqyaslı tikintisi, yenidənqurulması və əsaslı təmirinin dəstəklənməsi nəzərdə tutulur.

Ümumi təhsil sahəsində həyata keçiriləcək islahatların əsas prioritetlərinə uyğun olaraq, sağlam və səmərəli təhsil mühitinin yaradılması, təhsilin keyfiyyətinin yüksəldilməsi və məktəblərin idarəedilməsinin müasir tələblər səviyyəsinə çatdırılması istiqamətlərində fəaliyyət 2014-cü il ərzində də uğurla davam etdirilib.

Ölkəmizdə ilk dəfə olaraq ümumi təhsil müəssisələrində işləyən müəllimlərin peşəkarlıq səviyyəsinin qiymətləndirilməsi və əlavə təlim ehtiyaclarının müəyyənləşdirilməsi məqsədilə 10-13 iyun və 20 sentyabr 2014-cü ildə Bakı şəhərinin dövlət ümumi təhsil məktəblərində çalışan 30 mindən çox müəllimin bilik və səriştəsinin diaqnostik qiymətləndirilməsi keçirilib. Diaqnostik qiymətləndirmənin nəticələrinə əsasən pilot layihə kimi xüsusi elektron qaydada dərs bölgüsü aparan proqram hazırlanaraq 20 məktəbdə sınaqdan keçirilib. Bununla yanaşı, qiymətləndirmənin nəticələri bütün ümumi təhsil məktəblərində dərs bölgüsü zamanı nəzərə alınıb.

Bakıdakı məktəblərdə çalışan 30 min müəllimin dərs yükü orta hesabla 18 saat civarındadır. Odur ki, müvafiq sərəncamın icrası çərçivəsində heç bir müəllimin ixtisarı nəzərdə tutulmur.

Qeyd etdiyim kimi, Prezident İlham Əliyev tərəfindən müəllimlərin bilik və səriştəsinin diaqnostik qiymətləndirilməsinin nəticələri nəzərə alınaraq, bu prosesdə iştirak etmiş müəllimlərin dərs yükü və əməkhaqqı artırılıb. Dövlət başçısının sərəncamı təhsil ictimaiyyəti tərəfindən rəğbətlə qarşılanıb, pedaqoji sahədə çalışanların ruh yüksəkliyinə səbəb olub. Müəllimlərin həm dərs yükünün, həm də əməkhaqqının artırılması ehtiyacı sistemin qeyri-optimal olmasından qaynaqlanırdı.

Hər zaman müəllimlərin əməkhaqqının artırılması məsələsi müzakirə olunarkən bunun icrası yolları və forması əsas suallardan biri kimi qarşıda dururdu. Düşünürdük ki, əməkhaqqı artımı, ilk növbədə, təhsilin keyfiyyətinin yüksəldilməsinə xidmət etməlidir.

Bu sərəncama nəzər salarkən aydın şəkildə görünür ki, dövlət başçısı üçün insan kapitalının inkişafı nə dərəcədə vacibdir. Sözsüz ki, hər bir ölkənin ən böyük sərvəti insanlardır. İnsan kapitalının inkişafı daha rəqabətli, Azərbaycanın maraqlarını hər bir sahədə - iqtisadi, sosial və siyasi sahədə daha uğurla təmsil etməyi bacaran insanların yetişdirilməsindən ibarətdir.

Bütün bu məsələlərin həlli üçün aparılan müzakirələrdə təhsil sisteminin səmərəli fəaliyyət imkanları tapıldı və ən qısa

müddətdə təhsilalanların bunu hiss etməsi üçün yollar müəyyənləşdirildi. Növbəti mərhələdə isə diaqnostik qiymətləndirmə ilə ölkəmizin bütün regionlarında çalışan müəllimlərin əhatə edilməsi nəzərdə tutulub.

Yeri gəlmişkən onu da qeyd edim ki, hazırda qanunvericiliyə uyğun olaraq, regionlardakı ucqar kənd məktəblərində çalışan bir çox müəllimlərə əlavə ödənişlər və əlavə güzəştlər tətbiq olunur. Belə ki, Təhsil Nazirliyinin təklifləri nəzərə alınaraq Nazirlər Kabinetinin qərarı ilə "Pedaqoji profilli ixtisaslar üzrə ali və orta ixtisas təhsili müəssisələrini bitirmiş və ümumi təhsil müəssisələrində işə başlamış gənc mütəxəssislər üçün əlavə güzəştlər və stimullaşdırıcı tədbirlərin müəyyən edilməsi haqqında" Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2010-cu il 14 aprel tarixli 67 nömrəli qərarında dəyişikliklər edilib. Həmin qərar nəticəsində müvafiq təhsil müəssisələrindəki vakansiyaların azaldığını müşahidə edirik. Bütün bunlar təhsil sistemində kadr potensialının optimallaşdırılması üçün tətbiq olunan təşviq mexanizmlərindən biridir.

Təhsil sisteminin optimallaşdırılmasına uyğun olaraq, müəllim-şagird nisbətinə diqqət yetirilməsi olduqca vacib məsələlərdəndir. Bu gün region ölkələri ilə müqayisədə Azərbaycanda bir müəllimə düşən şagird sayı göstəricisi daha aşağıdır. Müəllimlərin dərs yükünün müvafiq həddə çatdırılması ilə müəllim-şagird nisbəti də normal məcraya düşəcəkdir.

Bacarıqlarının diaqnostik qiymətləndirilməsi aparılan müəllimlərin dərs yükünün və əməkhaqqının artırılmasını prosesin ilk mərhələsi kimi səciyyələndirə bilərik. Növbəti mərhələdə isə müəllimlərin fəaliyyət keyfiyyətinə, bilik və bacarıqlarının səviyyəsinə görə diferensial əməkhaqqının müəyyənləşdirilməsi nəzərdə tutulur.

Müəllimləri maraqlandıran bir məsələyə də toxunum ki, paytaxt məktəblərində çalışan, diaqnostik qiymətləndirilmədə hər hansı bir səbəbdən iştirak etməmiş müəllimlərə də bu prosesi keçmək imkanı yaradılacaqdır.

Təhsilin inkişafı ilə bağlı beş əsas istiqaməti ehtiva edən "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda da təhsilverənlərə, yəni müəllimlərə xüsusi yer ayrılır.

Məlumdur ki, hər bir təhsil sisteminin səviyyəsi bu sahədə çalışan müəllimin gücündən artıq ola bilməz. Bu baxımdan müəllimlərin bilik və bacarıqlarının artırılması, müəllim nüfuzunun yüksəldilməsi, istedadlı gənclərin pedaqoji sahədə çalışmaq üçün stimullaşdırılması yönündə Təhsil Nazirliyi tərəfindən bir sıra addımlar atılmaqdadır. Sevindirici haldır ki, müəllimlərin böyük bir qismi yeniliklərin tətbiqindən məmnundur və islahatlara həvəslə dəstək verirlər.

Məlum olduğu kimi, Təhsil Nazirliyi tərəfindən ilk dəfə 2014-2015-ci tədris ilindən pedaqoji kadr hazırlığı aparılan ali təhsil müəssisələrinə qəbul imtahanlarında 500 və daha yüksək bal toplayan, ixtisas seçimində birinci və ya ikinci yerdə müəllimlik ixtisasını qeyd edən 300 tələbəyə "Gələcəyin müəllimi təqaüdü" verilib. Təqaüdün təsis edilməsi peşəkar bilik və kompetensiyalara malik pedaqoji kadrların hazırlanmasına, müəllim peşəsinin nüfuzunun yüksəldilməsinə xidmət edir.

Hesab edirəm ki, cəmiyyətdə müəllim nüfuzunun yüksəldilməsi üçün ilk növbədə təhsilə, tərbiyəyə, böyüklərə və müəllimlərə hörmətə xüsusi yer verilən milli dəyərlərimizi qorumalıyıq. Təhsil Nazirliyi gənclərdə bu peşəyə marağı artırmağa çalışır. Bu istiqamətdə dövlət başçısının tapşırığı ilə pedaqoji universitetin kampusunun layihəsi hazırlanır. Orada gələcək müəllimlərin dünyagörüşünün formalaşdırılması və keyfiyyətli təhsil almaları üçün

səmərəli mühit yaradılacaqdır.

Məqsədyönlü dövlət siyasətinin nəticəsidir ki, son 11 il ərzində Azərbaycanda 3000-ə yaxın ümumtəhsil müəssisəsi tikilib və ya əsaslı təmir olunub. Müqayisə üçün qeyd edək ki, ərazisinə və iqtisadi imkanlarına görə Azərbaycandan üstün olan, sürətlə inkişaf edən Qazaxıstanda isə bu dövrdə 700 məktəb inşa olunub.

2014-cü ildə Təhsil Nazirliyinin sifarişi ilə 3 dövlət təhsil müəssisəsi tikilib, 2 təhsil müəssisəsində əsaslı təmir işləri aparılıb, 94 tədris ocağı isə cari təmir edilib. 2015-ci ildə isə 92 təhsil müəssisəsi üçün yeni binanın tikintisi, 64 təhsil müəssisəsinin binasının əsaslı təmir olunması və 50 təhsil müəssisəsində isə cari təmir işlərinin aparılması nəzərdə tutulub.

Ötən il əsas məqsədi istedadlı şagirdlərin seçilib inkişaf etdirilməsi və şagirdlərin olimpiadalara mütəşəkkil və davamlı şəkildə hazırlanmasının təşkilindən ibarət olan İnformatika üzrə Olimpiada Mərkəzi açılıb. Həmçinin Təhsil Nazirliyinin təşəbbüsü ilə riyaziyyat və təbiət elmləri üzrə fənn müsabiqələri keçirilib.

2014-2015-ci tədris ilindən "Sağlam təhsil-sağlam millət" layihəsi çərçivəsində ölkəmizin 6 ümumi təhsil məktəbində 15 pilot "Sağlam təhsil sinfi" fəaliyyət göstərir. "Sağlam təhsil-sağlam millət" layihəsinin məqsədi təhsilalanların təlim nailiyyətlərini yüksəltməklə yanaşı, tədris şəraitindən irəli gələn hərəkət məhdudiyyətini və digər amilləri aradan qaldırmaq, onların sağlamlığını qorumaqdan ibarətdir.

Keyfiyyətli təhsildən danışırıqsa, müvafiq tələblərə cavab verən tədris resursları və dərsliklər əsas yerlərdən birini tutur. Bu baxımdan qarşıda duran vəzifələri yerinə yetirmək üçün Təhsil Nazirliyi tərəfindən kompleks işlər görülməkdədir. Belə ki, Dərslikləri Qiymətləndirmə Şurasının müsabiqə əsasında yeni tərkibi formalaşdırılıb. 2014-cü ildə ilk dəfə olaraq Azərbaycanda maksimum adda və sayda - 271 adda 7,8 milyon ədəd dərslik çap olunub. Bəzi siniflər üçün tam yeni, qalanları üçün təkrar nəşr olunan bu kitablar vaxtında bütün məktəblərə çatdırılıb. Dərsliklərin satış məqsədilə çap edilməsindən əldə olunan gəlirin istifadəsi barədə müvafiq qərara əsasən, dərsliklərin əlavə nəşrindən Təhsil Nazirliyinin hesabına daxil olan vəsaitin 50 faizinin dərslik müəlliflərinə ödənilməsi nəzərdə tutulub.

Növbəti dərs ili üçün VIII sinif dərsliklərinin hazırlanması üzrə tender bir il əvvəl elan edilib. Tender proseduru üzrə təqdim edilən və qalib gələn dərsliklər məhdud sayda çap edilərək pilot məktəblərdə sınaqdan keçirilir. İrad və təkliflər nəzərə alındıqdan sonra çap edilib növbəti dərs ilinin başlanmasından xeyli əvvəl məktəblərə paylanacaqdır. Həmçinin növbəti tədris ili üzrə IV sinif dərslikləri əsaslı şəkildə təkmilləşdirilərək çap ediləcək, ümumtəhsil məktəblərinin IX sinifləri üçün bir il əvvəlcədən dərsliklərin hazırlanması üzrə tender elan ediləcək. Həmin dərsliklər 2016-2017-ci dərs ilindən istifadəyə veriləcək.

"Ümumtəhsil müəssisələrinə və peşə liseylərinə müəllimlərin yerdəyişməsi və işə qəbulu Qaydaları"na müvafiq olaraq hazırda işləyən müəllimlərin bir rayondan (şəhərdən) digər rayona (şəhərə) yerdəyişməsi ilk dəfə olaraq ötən il Təhsil Nazirliyi tərəfindən mərkəzləşdirilmiş qaydada müsabiqə yolu ilə həyata keçirilib. İş yerini dəyişmək üçün 1149 nəfər müəllim elektron ərizə verib. Yekun nəticəyə əsasən 96 nəfər iş yerini dəyişmək hüququ qazanıb.

2014-2015-ci tədris ilində ümumi təhsil müəssisələrinə və peşə liseylərinə müəllimlərin işə qəbulu üzrə müsabiqənin nəticələrinə əsasən ümumilikdə 1692 nəfər işə qəbul olunub ki, onlardan 1405 nəfərinə (83 faiz) həvəsləndirmə tədbirləri tətbiq edilib.

Vakansiyaların tutulma səviyyəsi ötən dərs ilinə nisbətən 40 faiz artıb. 2014-2015-ci tədris ilində yeni işə qəbul olunan pedaqoji işçilər ilk dəfə "Müəllim andı" içərək fəaliyyətə başlayıb.

Kənd məktəblərində ciddi ehtiyac duyulan kimya, fizika, biologiya və coğrafiya fənləri üzrə işə qəbul olunanların sayında artım olub. Belə ki, coğrafiya fənni üzrə 230, fizika fənni üzrə 175, biologiya fənni üzrə 161, kimya fənni üzrə 89 nəfər işə qəbul olunub.

Məktəb direktorları və məktəb direktoru olmaq arzusunda olan digər şəxslər üçün müasir peşə standartları əsasında təlimlər təşkil edilib. Təlimlərdən uğurla keçmiş və keyfiyyət sertifikatı almış 15 nəfər paytaxtdakı ümumtəhsil müəssisələrinə direktor təyin olunub. Artıq ümumtəhsil müəssisələrində təlim-tərbiyə işləri üzrə direktor müavini, tərbiyə işləri üzrə direktor müavini (təşkilatçı) və laborant vəzifələrinə işə qəbul olunmaq üçün keçirilən ikinci müsabiqə başa çatmaq üzrədir.

2014-2015-ci tədris ilindən ölkəmizin ümumtəhsil müəssisələrində pedaqoji kadrlara olan tələbat nəzərə alınaraq yenidənhazırlanma təhsili üzrə ixtisasların sayı artırılıb və yeni ixtisaslar üzrə müəllim hazırlıqlarına başlanılıb. Bu sıraya riyaziyyat-informatika, kimya-biologiya, tarix-coğrafiya ixtisasları daxildir.

Məktəblilərin vətənpərvərlik tərbiyəsinin daha yaxşı təşkili məqsədilə 2014-2015-ci tədris ilindən ümumtəhsil məktəblərinin VIII siniflərində "Qarabağın tarixi" adlı fakültativ kurs tədris olunur.

2014-cü ilin fevral-may aylarında rayon və şəhərlərdəki ümumtəhsil məktəblərinin XI sinif şagirdləri üçün Heydər Əliyev mərkəzlərində "Müstəqil Azərbaycan tarixi" mövzusunda əlavə dərslər tədris olunub. Dərslər şagirdlərə müasir Azərbaycan tarixi haqqında daha dolğun və əhatəli məlumatların verilməsi məqsədilə təşkil edilib. Müvafiq istiqamətdə təlimin keyfiyyətinin yüksəldilməsi və məktəblilərin potensial imkanlarının üzə çıxarılması baxımından mühüm əhəmiyyət kəsb edən dərslər, eyni zamanda şagirdlərin milli-mənəvi dəyərlərə malik, sağlam əqidəli, vətənpərvər, müasir dünyagörüşlü şəxsiyyət kimi formalaşmasına və yetkin vətəndaş kimi müstəqil həyata hazırlanmasına xidmət edir. Qeyd olunan dərsləri tədris edəcək müəllimlər və dərslərin mövzuları əvvəlcədən müəyyənləşdirilib. Həmçinin müəllimlərə kömək məqsədilə müvafiq tezislər və tövsiyələr hazırlanıb.

İnternat məktəblərdə təhsil alan uşaqlara qayğı ildən-ilə artır. Heydər Əliyev Fondunun gördüyü işlər nəticəsində internat məktəblərinin bir çoxu əsaslı tikinti və yenidənqurmadan sonra yeni görkəm alıb. Hazırda Bakı şəhərində yerləşən 3 internat məktəbində əsaslı təmir və tikinti işləri aparılır, 4 internat məktəbində isə cari ildə təmir işlərinə başlanılması nəzərdə tutulur.

Təhsil müəssisələrinin İKT avadanlıqları ilə təminatı istiqamətində 2014-cü il ərzində də təsirli tədbirlər görülüb. Təhsil müəssisələrinə 6000 ədəd kompüter, 3000 ədəd nooutbuk, 700 ədəd proyektor, 1377 ədəd elektron lövhə verilib. 200 təhsil müəssisəsi genişzolaqlı internet xəttinə qoşulub.

Ötən ilin ən böyük uğurlarından biri də elektron dərslik portalının (www.e-derslik.edu.az) istifadəyə verilməsi olub. Portal təhsilalanların dərslikləri elektron formatda oxumasına imkan yaradır. Məktəblilər portal vasitəsilə istənilən vaxt və məkanda dərsliklərə müraciət edə biləcəklər. Bu sistem təhsilalanların dərsliklərdən istifadəsində mobilliyi artıracaq, onların öyrənmə prosesinin fərdiləşməsinə şərait yaradacaqdır. Həmçinin elektron resursları bir mənbədə cəmləşdirmək üçün www.e-

resurs.edu.az portalı yaradılıb. Portal vasitəsilə hər bir istifadəçi elektron dərsliklər, videodərslər, müsabiqələr, elektron tapşırıqlar, müxtəlif oyunlar və digər bu kimi təhsil resurslarına çıxış əldə edə bilər.

Təhsil Nazirliyi tərəfindən kənd təsərrüfatı sahəsi üzrə ixtisaslaşmış ilk peşə-ixtisas təhsili müəssisələrinin maddi-texniki və tədris bazasının müasir tələblərə uyğunlaşdırılması məqsədilə yeni texnika, avadanlıq, əyani və texniki vasitələrin alınması prosesinə start verilib. Belə ki, İsmayıllı Peşə Tədris Mərkəzi, Balakən 1 nömrəli Peşə Məktəbi, Cəlilabad Peşə Liseyi, Bərdə Peşə Liseyi, Quba Peşə Liseyi, Şamaxı Peşə Liseyi, Göyçay Peşə Liseyi üçün 6 traktor, 4 otbağlayan, 7 traktor qoşqusu, 5 kotan, 6 toxumsəpən, 3 otbiçən, 3 taxıl və qarğıdalıyığan kombayn, 3 dərmançiləyici, 2 gübrəsəpən, 1 yemüyüdən texnika alınıb. İlk peşə-ixtisas təhsili müəssisələrinə sonuncu dəfə belə texnika və avadanlıqlar 25-30 il əvvəl verilib.

Avtomobil nəqliyyatı ixtisası üzrə kadr hazırlayan ilk-peşə ixtisas təhsili müəssisələrinə 11 ədəd “Renault Logan” markalı nəqliyyat vasitəsi verilib. Bütün bunlar müvafiq sahədə fəaliyyət göstərən ilk-peşə ixtisas təhsili müəssisələrinin maddi-texniki bazasının müasir tələblərə uyğunlaşdırılması, mütəxəssis hazırlığı işinin səmərəliliyinin artırılması məqsədlərinə xidmət edir.

Azərbaycan Respublikası Hökuməti və Koreya Respublikası Hökuməti arasında Peşə Tədris Mərkəzinin yaradılması layihəsi üzrə Kredit Sazişi imzalanıb. Layihənin büdcəsi 39,28 milyon ABŞ dolları təşkil edir. Bu vəsaitin 22 milyonu Koreya İqtisadi İnkişaf və Əməkdaşlıq Fondu tərəfindən maliyyələşdiriləcəkdir. Təhsil Nazirliyi və Norveçin Roqaland Təlim və Təhsil Mərkəzi Fondu arasında Əməkdaşlıq Memorandumu imzalanıb. Bu layihə çərçivəsində pilot olaraq bir neçə peşə məktəbində yeni idarəetmə modelinin tətbiqi, tədris materiallarının hazırlanması, mühəndis-pedaqoji heyət üçün yeni ixtisasartırma, yenidənhazırlanma və ixtisasdəyişmə modelinin tətbiqi, normativ-hüquqi bazanın təkmilləşdirilməsi sahəsində birgə tədbirlərin həyata keçirilməsi nəzərdə tutulur.

Təhsil Nazirliyi ilə Sahibkarlar (İşəgötürənlər) Təşkilatları Milli Konfederasiyası, “Azərbaycan Polad İstehsalı Kompleksi” Qapalı Səhmdar Cəmiyyəti və Azərbaycan Qızıl Aypara Cəmiyyəti arasında ikitərəfli anlaşma memorandumları imzalanıb. Memorandumlar Təhsil Nazirliyi ilə müvafiq qurumlar arasında əlaqələrin daha da inkişaf etdirilməsi, müasir tələblərə cavab verən kadrların hazırlanmasında birgə fəaliyyəti nəzərdə tutur.

İlk peşə-ixtisas təhsili müəssisələri üçün müasir idarəetmə bilik və bacarığına yiyələnmiş, informasiya texnologiyalarına bələd, ölkəmizin təhsil və sosial inkişafına töhfə verə biləcək direktorlar yetişdirmək və onların bacarıqlarını təkmilləşdirmək məqsədilə “Liderlik və idarəetmə” təliminə başlanılıb. Təhsil Nazirliyi, “Allianz Consult” MMC və “GİZ” Almaniya Beynəlxalq Əməkdaşlıq Cəmiyyəti tərəfindən birgə təşkil edilən ilk peşə-ixtisas təhsili müəssisələrinin direktorları və gələcəkdə bu vəzifədə çalışmaq arzusunda olan təlim iştirakçıları müsabiqə əsasında müəyyənləşdirilib.

Orta ixtisas təhsili müəssisələrində son illərdə real tələbata əsaslanmadan artırılmış qəbul yerlərinin sayı keçən tədris ilinə nisbətən azaldılaraq 15 667 yerdən 11266 yerə endirilib. Qiyabi təhsil forması üzrə kolleclərə tələbə qəbulu planı əvvəlki tədris ilinə nəzərən 4,1 dəfə azaldılıb, “ibtidai sinif müəllimliyi” və “informatika müəllimliyi” ixtisasları qəbul planından çıxarılıb. Kolleclərə “məktəbəqədər təlim və

tərbiyə” ixtisası üzrə qəbul yerləri əvvəlki tədris ilinə nisbətən 38 faiz az planlaşdırılıb. Texniki istiqamətli kolleclərdə müəllimlik ixtisasları tələbə qəbulu planından çıxarılıb.

Nazirlər Kabinetinin qərarı ilə təsdiq olunmuş “Orta ixtisas təhsili müəssisələrində kredit sistemi ilə tədrisin təşkili Qaydaları”na və Təhsil Nazirliyinin müvafiq əmrinə uyğun olaraq 2014-2015-ci tədris ilindən tələbələr kredit sistemi əsasında təhsil alır. Bununla bağlı bütün zəruri hazırlıq işləri aparılıb, 115 ixtisas üzrə kredit sisteminə əsaslanmış təhsil proqramları tətbiq edilib.

“Azərbaycan 2020: gələcəyə baxış” İnkişaf Konsepsiyasına uyğun olaraq regional kolleclərin yaradılması işinə başlanılıb. Nazirlər Kabinetinin müvafiq qərarları ilə Masallı Dövlət Regional Kolleci, eləcə də İsmayıllı Dövlət Humanitar və Texnologiya Kolleci yaradılıb.

Təhsil Nazirliyi tərəfindən 2014-cü ildə ali təhsil sahəsində həyata keçirilmiş islahatların əsas prioritetləri sırasında olan SABAH (savadlı, bacarıqlı, hazırlıqlı) qruplarının təşkili ali təhsil müəssisələrinin fəaliyyətinin effektivliyinin təmin olunması, tələbə qəbulu planının formalaşdırılmasına dair yanaşmaların təkmilləşdirilməsi, dövlət sifarişində iştirak edəcək universitetlərin seçim meyarlarının hazırlanması, ölkə iqtisadiyyatının inkişaf səviyyəsinə cavab verən müasir kadr hazırlığının təmin edilməsi, habelə ali təhsil proqramlarının (standartlarının) Avropa məkanında tətbiq olunan müvafiq sənədlərə uyğunlaşdırılması məqsədilə tədris proqramlarına (standartlarına) yenidən baxılması, abituriyentlərin peşəyönümlü ixtisas seçimi mexanizminin formalaşdırılması, orta məktəblərin, ilk peşə və orta ixtisas təhsili müəssisələrinin müvafiq ali təhsil müəssisələrinə təhkim edilməsi, aztəminatlı gənclərin ali təhsil almaq imkanlarının artırılması üçün pilot qaydasında təhsil kreditlərinin tətbiqinə başlanılması, ali təhsil müəssisələrinin fəaliyyətini tənzimləyən normativ bazanın təkmilləşdirilməsi və korporativ idarəetmə prinsiplərinin tətbiqi, dövlət ali təhsil müəssisələrində maliyyə hesabatlılığı sisteminin tətbiqinin genişləndirilməsi, ali təhsil müəssisələrinin akkreditasiya sisteminin yaradılması kimi məsələlər əsas yer tutur.

Ölkənin 7 ali məktəbində 37 ixtisas üzrə SABAH qrupları fəaliyyətə başlayıb. Hazırda 769 tələbənin təhsil aldığı bu qruplarda 158 müəllim dərs deyir. Tələbələrdən 200 nəfəri yataqxana ilə təmin olunub. Layihənin əsas hədəfi ali təhsilin yeni inkişaf istiqamətlərinin müəyyənləşdirilməsi, tədrisin təşkilində mütərəqqi forma və metodları tətbiq etməklə keyfiyyətin yüksəldilməsidir.

Təhsil Nazirliyinin təşkilatçılığı ilə ilk dəfə 1-ci SABAH Forumu keçirilib. İki günlük forumda ölkənin müxtəlif ali təhsil müəssisələrinin SABAH qruplarında təhsil alan 250 nəfərə yaxın tələbəsi iştirak edib. Forumun keçirilməsində əsas məqsəd ölkə təhsilinin strateji hədəfləri barədə ətraflı məlumatların verilməsi, müasir dövrün tələblərinə uyğun yüksək biliyə malik cəmiyyətin qurulmasında tələbələrin rolunun müəyyənləşdirilməsi və tələbələr arasında dialoqun yaradılmasından ibarətdir.

Ali təhsilin bakalavriat və magistratura səviyyələrinə 2014-2015-ci tədris ili üzrə tələbə qəbulu planında bir sıra mühüm yeniliklər tətbiq olunub. 2013-2014-cü tədris ilinin faktiki qəbuluna nisbətən Azərbaycanda fəaliyyət göstərən ali təhsil müəssisələrinə cari tədris ili üçün qəbul planı 12,9 faiz artırılıb. Qiyabi təhsil forması üzrə plan 2 dəfədən çox azaldılaraq bu yerlərin hesabına əyani tələbə qəbulu planı artırılıb.

Ali təhsil müəssisələrində magistratura səviyyəsi üzrə qiyabi təhsil forması nəzərdə tutulmayıb. Bakalavriat buraxılışı olmayan ixtisasların magistratura

səviyyəsinə plan yerləri ayrılmayıb. Təhsil, texniki və texnoloji, eləcə də kənd təsərrüfatı ixtisaslarına dövlət sifarişi yerləri artırılıb. Kənd təsərrüfatı ixtisas qrupuna daxil olan ixtisaslara qəbul yalnız dövlət sifarişi əsasında aparılıb.

2014-2015-ci tədris ilindən etibarən ali təhsilin bakalavriat səviyyəsində məzunun bilik, bacarıq və vərdişlərinə qoyulan kompetensiyaları özündə əks etdirən 138 ixtisas üzrə yeni nəsil təhsil proqramlarının və buna müvafiq hazırlanmış tədris planlarının tətbiqinə başlanıb. Müəllim hazırlığı aparılan ali təhsil müəssisələrində qoşa ixtisaslar (riyaziyyat və informatika, kimya və biologiya, tarix və coğrafiya) üzrə kadr hazırlığı 5 illik tədris planları əsasında aparılır.

Ölkəmizdə ilk dəfə olaraq Azərbaycan Dövlət İqtisad Universitetində İnnovativ Biznes-İnkubatoru yaradılıb. Layihənin əsas missiyası gənc menecer və sahibkarların yetişdirilməsi, tələbə və gənclərin biznesə cəlb edilməsidir. Layihənin əsas hədəfi tələbə startapçılara bizneslərinin qurulmasında dəstək göstərmək və innovativ iqtisadiyyatın inkişafina töhfə verməkdən ibarətdir.

Heydər Əliyev Mərkəzi və Təhsil Nazirliyi tərəfindən ali təhsil müəssisələrinin tələbələri arasında “Heydər Əliyev və Azərbaycan tarixi” adlı ümumrespublika bilik yarışı keçirilib. Layihə ümummilli lider Heydər Əliyevin həyat və fəaliyyətinin dərindən öyrənilməsi, ulu öndərin irsinin təbliği məqsədi daşıyır. Yarışda ölkənin ali təhsil müəssisələrində bakalavriat və magistratura səviyyələri üzrə əyani təhsil alan tələbələrdən ibarət komandalar iştirak edib.

2014-2015-ci tədris ilində azərbaycanlı gənclərə “2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı” çərçivəsində dünyanın 33 ölkəsinin 544 ali təhsil müəssisəsində təhsil almaq məqsədilə müraciət etmək imkanı verilib. Dövlət proqramı çərçivəsində namizədlərlə tam şəffaf şəkildə təhsil alacaqları dildə ali təhsil müəssisələrinin, nazirliklərin, qeyri-hökumət təşkilatlarının əməkdaşlarından ibarət tərkibdə komissiyalar tərəfindən müsahibələr aparılıb və obyektiv seçim edilib. Dövlət proqramına 2014-2015-ci tədris ili üçün namizədlərin seçimi prosesində şəffaflığın təmin olunması məqsədilə müsahibə zamanı ilk dəfə audio-videoçəkiliş aparılıb. Aparılmış seçim nəticəsində 573 tələbənin adı dünyanın nüfuzlu ali məktəblərində təhsil almaq hüququ qazanmış proqram təqaüdçüləri siyahısına daxil edilib.

Dövlət proqramının əsas məqsədi qısa perspektivdə ölkəmizin yüksək rəqabət qabiliyyətli kadrlara olan tələbatını ödəmək olduğundan seçimlər zamanı bakalavriatdan sonrakı təhsil səviyyələrinə üstünlük verilib. Belə ki, seçimlər nəticəsində 310 nəfər magistratura, 44 nəfər doktorantura, 65 nəfər rezidentura təhsili almaq hüququ qazanıb. Ölkəmiz üçün prioritet müəyyən olunan mühəndislik, tibb, informasiya texnologiyaları sahəsində yüksək göstəricilərə malik, beynəlxalq olimpiada iştirakçıları, müsahibə zamanı yüksək bilik, xarici dil hazırlığı nümayiş etdirmiş 154 tələbə isə baza ali tibb və bakalavriat səviyyələrində təhsil almaq imkanı əldə edib.

Sevindirici haldır ki, ilk dəfə olaraq 9 nəfər kənd təsərrüfatı, 14 nəfər isə təhsilin təşkili və idarəolunması kimi vacib sahələr üzrə təhsil almaq hüququ qazanıb. Tələbələr əsasən Türkiyə, Böyük Britaniya və digər inkişaf etmiş ölkələrdə təhsil almağa üstünlük veriblər. Bununla yanaşı, Kanadada 29, Rusiyada 25, Avstraliyada 19, ABŞ-da 16 nəfər tələbə təhsilini davam etdirmək imkanı qazanıb. Dövlət proqramı çərçivəsində indiyədək 3000-dən çox gənc dünyanın aparıcı ali təhsil müəssisələrində təhsil almaq

imkanı əldə edib. Onu da qeyd edək ki, Təhsil Nazirliyi tərəfindən 2015-2020-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə yeni dövlət proqramı hazırlanır.

2015-2016-cı tədris ilində isə azərbaycanlı gənclər dövlət proqramı çərçivəsində dünyanın 33 ölkəsinin 419 ali təhsil müəssisəsində müvafiq prioritet ixtisas istiqamətləri üzrə təhsil almaq məqsədilə müraciət edə biləcəklər.

Eyni zamanda, bu il prioritet ixtisas istiqamətlərinin əhatəliyinin genişlənməsi, yüksək texnologiyalar, sənaye, ekologiya kimi yeni ixtisas istiqamətlərinin əlavə olunması tələbələrə ölkənin inkişaf prioritetlərinə uyğun olaraq geniş seçim imkanı yaradacaqdır. Prioritet ixtisas istiqamətləri I və II dərəcəli olmaqla müəyyən edilib. Bu il keçiriləcək müsabiqədə əsas üstünlük I dərəcəli ixtisas istiqamətlərinə veriləcəkdir.

Azərbaycan Respublikası Prezidentinin "Dövlət orqanlarında elektron xidmətlərin göstərilməsi haqqında" fərmanından və "Vətəndaşların müraciətlərinə baxılması qaydası haqqında" Azərbaycan Respublikasının Qanunundan irəli gələn vəzifələrin səmərəliliyinin artırılması məqsədilə Təhsil Nazirliyi tərəfindən müvafiq tədbirlər həyata keçirilib. Belə ki, ötən il Təhsil Nazirliyinin yeni Telefon Məlumat Mərkəzi və Vətəndaşların Qəbulu Mərkəzi istifadəyə verilib. Mərkəzlərə xüsusi təlim keçmiş əməkdaşlar cəlb olunub. Vətəndaşların Qəbulu Mərkəzində ötən il 58370 vətəndaşa xidmət göstərilib.

Təhsil Nazirliyi tərəfindən göstərilən elektron xidmətlərin sayı və keyfiyyəti artırılıb. Hazırda 6 interaktiv və 20-dən artıq informativ elektron xidmət göstərilir.

Təhsil Nazirliyinin KİV və QHT-lərlə daha səmərəli münasibətlərin qurulması üçün həyata keçirilən siyasət ictimaiyyətlə əlaqələrinin daha açıq, şəffaf və operativ qurulmasına xidmət edir. Bu məqsədlə "dəyirmi masa"lar, seminar və brifinqlər keçirilib, jurnalistlərin və QHT təmsilçilərinin təhsil müəssisələrinə səfərləri təşkil olunub. Həmçinin təhsil və müdafiə nazirliklərinin birgə təşkilatçılığı ilə cəbhəyanı bölgəyə - Ağdam, Tərtər, Ağcabədi, Qazax və Tovuz rayonlarına səfərlər çərçivəsində media nümayəndələri ümumtəhsil müəssisələrində olub, gənclərin çağırışaqədərki hazırlığı və digər dərslərdə iştirak ediblər. Eləcə də media nümayəndələri və şagirdlər hərbi hissələrdə əsgərlərin döyüş hazırlığı səviyyəsini nümayiş etdirən çıxışlarını izləyiblər.

Azərbaycan təhsilinin inkişafı istiqamətində 2014-cü ildə həyata keçirilən işlər bir məqsədə - təhsilin müasir tələblər səviyyəsinə yüksəldilməsi və keyfiyyətinin artırılması ilə bağlı qarşıda duran vəzifələrin uğurlu həllinə xidmət edir.

**"Azərbaycan" qəzeti, 2015, 1 mart**



***Təhsil Strategiyası***

# MƏKTƏBİ İDARƏETMƏNİN NƏZƏRİ VƏ TƏCRÜBİ MƏSƏLƏLƏRİNƏ DAİR

**Əjdər Ağayev,**
***pedaqogika üzrə elmlər doktoru, professor, əməkdar müəllim***

***Açar sözlər:*** ***idarəetmə, məktəbi idarəetmə, üslublar, funksiyalar, idarəedən, idarəolunan, pedaqoji şura.***

***Ключевые слова:*** ***управление, управление школой, стили, функции, управляющей, управляемый, педагогический совет.***

***Key words:*** ***governance, school governance, styles, functions, manager, guided, pedagogical council.***

Bəlli olduğu kimi, fəaliyyətin bütün sahələrinin, peşə və ixtisasların elmi əsasları vardır. Bu sahələr, ilk növbədə, idarə olunur. Ona görə də bütün zamanlarda idarəetmə təcrübəsinə önəm verilmiş, qazanılan uğurların başlıca olaraq idarəetmə səriştəsindən asılı olduğu qeyd edilmişdir.

Ən qədim dövrdən insanlar ölkələrin, orduların idarəedilməsi məsələsinə diqqət vermişlər. Şəhərin, vilayətin abadlığının, insanların rifahının idarəetmədən xeyli dərəcədə asılı olduğunu bildirmişlər. Bununla əlaqədar olaraq hələ eramızdan əvvəlki əsrlərdə yaradılmış yazılı mənbələrdə, məsələn, "Bilqamış" dastanında, "Kəlilə və Dimnə", "Min bir gecə" kimi həyat təcrübəsi ilə dolu əsərlərdə müəyyən elementlər vardır.

Dövlətçiliyin inkişaf etdiyi orta əsrlərdə isə alimlər idarəetmə məsələlərinə diqqəti daha çox cəlb etmiş, hətta idarəedənin idarəetmə keyfiyyətlərinə hansı əlamətlərin daxil olduğunu da bildirmişlər. XIII əsrin görkəmli simalarından olan Nəsirəddin Tusinin "Əxlaqi-Nasiri" kitabı bu cəhətdən diqqəti xüsusilə cəlb edir. Bütün bunlara baxmayaraq, idarəetmə problemi elmi cəhətdən çox sonralar araşdırılmış, nəhayət, XIX əsrin sonlarından idarəetmə elm sahəsi kimi meydana çıxmışdır.

Müasir dövrümüzdə idarəetmə elmi olduqca zəngin, çoxistiqamətli və mühüm əhəmiyyət daşıyan faydalılığa malikdir.

Bu məqalədə məqsədim idarəetmə elminə ümumi baxış əks etdirmək deyil, idarəetmə elminə daxil olan sahələrdən biri kimi məktəbi idarəetmənin nəzəri və təcrübi məsələlərinə toxunmaqdır.

Məktəbi idarəetmə mühüm əhəmiyyət daşıyan sahədir. Buna görə də ayrıca araşdırma və tədqiqat tələb edir.

Təhsili idarəetmənin strukturunda məktəbi idarəetmə ayrıca mərhələ təşkil edir.

Qeyd etməliyəm ki, təhsilin, o cümlədən məktəbin idarəedilməsi problemlərinə aid əsərlər olduqca azdır. İlk dəfə 1977-ci

ildə - o zaman maarif naziri akademik Mehdi Mehdizadə təhsili idarəetmənin elmi-nəzəri əsaslarını əhatə edən məqalə ilə Moskvada və Bakıda çıxış etdi. Azərbaycanlı alimin bu araşdırması o zamankı SSRİ məkanında alimlərin rəğbətini qazandı.

Təəssüf ki, ötən dövr ərzində təhsili və ya məktəbi idarəetmə problemlərinə dair nəzəri və təcrübi əhəmiyyətli araşdırmalar az sayda aparılmışdır.

Konkret olaraq məktəbin idarəedilməsindən bəhs edilməsi ona görə vacibdir ki, burada təlim prosesinin idarəedilməsi ilə yanaşı, sinif kollektivinin və digər alt sahələrin də idarəedilməsi xüsusi əhəmiyyət daşıyır.

Müşahidələrimdən alınan nəticəyə görə belə qənaətə gəlirəm ki, idarəetmə - fəaliyyətin təşkili, məqsədə çatmaq üçün vəzifələrin yerinə yetirilməsinə səfərbərlik, tələbatların ödənilməsi, görülən işlərin və sosial mühitin keyfiyyətinə nəzarət və ona qiymət verilməsidir.

Məktəbin idarəedilməsi idarəetmə elminin nəzəriyyəsi və təcrübəsinə əsaslanır, lakin mahiyyətdən irəli gələn spesifik xüsusiyyətləri ilə fərqlənir.

Məktəbin idarəedilməsi – konkret bir təhsil müəssisəsində fəaliyyətin təşkili, təminatı, davamlılığının qorunması, görülən işlərə nəzarət, yoxlama və qiymətləndirmədir.

Məktəbi idarəetmənin əsasında onun hüquqi bazası dayanır. Hüquqi bazaya daxildir: Əsas Qanun, Təhsil Qanunu, Ümumtəhsilin Konsepsiyası, Məktəbin Nizamnaməsi, ali orqanın əmr və göstərişləri. Bu sənədlər sırasından bir neçə kəlmə Məktəbin Nizamnaməsi haqqında danışmaq istərdim.

Məktəbin Nizamnaməsi hökumətin təsdiq etdiyi ümumtəhsil məktəblərinin əsasnaməsinə uyğun olaraq hazırlanır. Məktəbin fəaliyyəti həmin Nizamnamə ilə tənzimlənir.

Təhsili, o cümlədən məktəbi idarəetmədə digər bir cəhət vardır ki, bu, pedaqoji tələblərin nəzərə alınması ilə bağlıdır. Yəni hüquqi sənədlər elə tərtib olunmalıdır ki, elmi-pedaqoji tələblərə uyğun olsun. Əks təqdirdə, arzuolunmaz nəticələr hasil ola bilər. Bununla əlaqədar olaraq müşahidə etdiyim bir faktı xatırlatmaq istərdim. Belə ki, bəzi lisey və gimnaziyalarda ümumtəhsil məktəbi əsasnaməsinin tələblərini nəzərə almadan öz nizamnamələrinə uyğun olaraq şagird iki və ya üç fəndən qeyri-kafi qiymət alarsa, onun məktəbdən xaric edilməsi qərarlaşdırılır. Müşahidə etdiyim liseylərdən birində oxuyan 13 yaşlı şagird qız digər fənlərdən “4”-“5” qiymətlər aldığı halda, bir müəllimin iki fənnindən “2” qiymət alıb. Bunu nəzərə alan məktəb rəhbərliyi Pedaqoji Şuranın qərarı ilə həmin məktəbli qızı məktəbdən tədris ilinin yarısında azad edib. Aldığı zərbədən sarsıntı keçirən yeniyetmə çıxılmaz vəziyyətdə qalıb. Yaxşı ki, yeniyetmənin keçirdiyi stressi başa düşən xeyirxah insanlar onu digər məktəbə bərpa ediblər. Sual olunur: Görəsən liseyin direktoru yeniyetmə qızın ilin yarısında məktəbdən xaric edilməklə, hansı faciələrə səbəb ola biləcəyini düşünübmü? Digər tərəfdən, liseyin direktoru Məktəbin Nizamnaməsinə şagirdin qiymətlə bağlı məktəbdən xaric edilməsini yazmaqla, antipedaqoji hərəkət etdiyini bilirmi?

Məlum pedaqoji tələblər var. O tələblərdə göstərilir ki, əgər şagird normal qabiliyyət sahibidirsə, yalnız bir və ya iki fəndən “qeyri-kafi” qiymətə layiq görülübsə, ona təlim verən müəllim günahkardır, şagird günahkar deyil. Məktəbin pedaqoji kollektivinin borcu şagirdləri biliklərə yiyələndirmək, onlarda bacarıq və vərdişləri formalaşdırmaqdır. Əgər bir müəlim bunu bacarmayıbsa, onun haqqında ölçü götürülməlidir. Digər tərəfdən, şagirdi cəzalandırmanın pedaqoji növləri var, o növlərdən istifadə edilməlidir. Məsələn,

şagirdin hərəkəti və ya narazılıq törədən davranışına görə onun partada yerini dəyişmək olar, onu sinifdən-sinfə keçirtmək olar.

İndi gəlin birlikdə düşünək. Məktəbi idarəedənin pedaqoji-psixoloji tələbləri nəzərə almaması görün nə qədər ziyanlı nəticələrə gətirib çıxarır.

Söhbət idarəetmə elmindən gedirsə, burada da əsas amil olan idarəedəndən, yəni insandan, onun şəxsi və peşəkarlıq keyfiyyətlərindən danışmaq lazımdır.

Hazırda bütün sahələrdə olduğu kimi, idarəetmə sahəsində də yeniləşmələr, texnologiyalardan istifadə diqqət çəkir. Buna görə də idarəedənlərlə idarəolunanlar arasında intellektual səviyyənin, innovasiyalardan istifadə bacarığının, ümumiyyətlə, yeniləşmə tendensiyasının gözlənilməsi əsas şərtlərdəndir.

Məktəbi idarəetmənin hüquqi əsasları konkret sənədlərə əsaslanır. Lakin bu o demək deyildir ki, idarəedən bununla da məhdudlaşmalıdır. Verilən hüquqi imkanlar dairəsində idarəetmənin təcrübi baxımdan zənginləşdirilməsi və daha da təkmilləşdirilməsi uğurların artmasına kömək edir.

Qloballaşmanın aktuallaşdığı indiki zamanda dünya təcrübəsinə inteqrasiyanın mümkünlüyü təcrübənin ən geniş miqyasda öyrənilməsinə zəmin yaradır.

Misal olaraq Türkiyədə, ABŞ-da, Estoniyada və digər daha bir neçə ölkədə məktəbi idarəetmə müşahidələrimin nəticəsindən belə bir yəqinlik hasil edirəm ki, hər bir mövcud təcrübədən faydalı olan nəyisə götürmək mümkündür.

Ölkəmizdəki ümumtəhsil məktəblərinin əksəriyyətində məktəbin direktoru məktəbdə həyata keçirilən bütün proseslərə müdaxilə edir. Məktəb direktorunun razılığı olmadan alt strukturların heç birində təşəbbüs irəli sürülmür və ya tədbir həyata keçirilmir. ABŞ təcrübəsində, Türkiyədə, eləcə də Estoniya təcrübəsində bu belə deyil. Məktəbin direktoru, təbii ki, bütün işlərə məsuldur, Pedaqoji Şuranın sədridir, daxili əmrləri verəndir. Lakin bu mərhələyə qədər direktor müavinlərinin, sinif rəhbərlərinin, dərnək rəhbərlərinin, valideyn komitəsi sədrlərinin, kitabxana müdirlərinin müvafiq olaraq idarəetmə funksiyaları yerinə yetirilir. Hər bir alt strukturun idarəedicisi sərbəstdir, müstəqildir, heç bir müdaxilə gözləmədən fəaliyyətini həyata keçirir. Onların hesabatları Pedaqoji Şurada dinlənilir və təkliflərinə müvafiq olaraq qərar çıxarılır. Bundan sonra direktorun əmrləri verilir. Belə bir təcrübənin olması idarəetmə şəbəkəsinin müstəqillik imkanlarını artırır, asılılığı aradan götürür.

Məktəbdə yaradıcılıq mühitinin mövcudluğu, müasir tələblərlə ayaqlaşma səyi, təbii ki, idarəetmə strukturunda da özünü göstərməlidir.

Məktəbi idarəetmənin uğurlu nəticələr verməsi idarəetmə formalarından və üslublarından düzgün istifadə etməkdən çox asılıdır. İdarəetmənin ən geniş yayılmış formalarından biri kollegiallıqdır. Kollegial idarəetmə strukturuna Pedaqoji Şura, istehsalat müşavirəsi, Metodiki Şura, yığıncaqlar, tarixi günlərin, bayramların, yaxud hüzn günlərinin kollektiv olaraq qeyd olunması və digər bu kimi kollektiv tədbirlər daxildir.

Pedaqoji Şura idarəetmədə ali orqan olaraq həlledici əhəmiyyət daşıyır. Şagirdlərin məktəbə qəbulu, müəllimlərin işə götürülməsi, tədris yükünün bölünməsi, sinif rəhbərlərinin müəyyənləşdirilməsi, qabaqcıl təcrübənin öyrənilib yayılması, rəğbətləndirmə, cəzalandırma – bütün bunlar Pedaqoji Şurada müzakirə olunur və təsdiqlənir. Məktəbin bütün müəllimləri, kitabxana müdiri, valideyn komitəsinin sədri Pedaqoji Şuranın üzvü olaraq kollegial qərarların çıxarılmasında fəal iştirak etməlidirlər. Eləcə də istehsalat müşavirəsində nizam-

intizam məsələləri müzakirə edilir, yenə ümumi rəy əsasında təkliflər irəli sürülür. Kollegiallıq strukturuna daxil olan bütün sahələr təqdim olunan ümumilik prinsipi ilə fəaliyyət göstərir.

Kollegial idarəetmə qərarların düzgün çıxarılmasına, hamının rəyinin nəzərə alınmasına, hər kəsin baş verən prosesdən xəbərdar olmasına, insanların bir-birini daha yaxşı tanımasına, hamının kollektivin qarşısında dayanan vəzifələri eyni maraqla yerinə yetirmələrinə səyini artırır.

İdarəetmənin digər bir forması fərdi-amiranə rəhbərlikdir. Bu zaman məktəb rəhbəri kollegiallıqdan qaçır, işçiləri fərdi qəbul edir və onlara fərdi göstərişlər verir, işlərin icrasını əmrlərin fərdlərə çatdırılması ilə yerinə yetirir, yalnız Pedaqoji Şuranın keçirilməsi ilə kifayətlənir.

Fərdi-amiranə idarəetmə kollektivdə xəbərçilərin, yaltaqların, öz mənafeyinə uyğun xəlvəti işlər görənlərin sayını artırır. Kollektiv üzvlərinin fəaliyyətini qiymətləndirmədə subyektiv yanaşmanı aktuallaşdırır. Buna görə də kollektivdə, necə deyərlər, giley-güzar, dedi-qodu mühiti yaranır.

Məktəbi idarəetmədə idarəetmə üslublarından düzgün bəhrələnməyin də böyük əhəmiyyəti vardır. Təcrübədən bəllidir ki, idarəetmədə bürokrat (avtokratik), mühafizəkar (avtoritar), liberal, qeyri-sabit, demokratik üslublar geniş yayılmışdır. Konkret münasibət bildirərək qeyd etməliyəm ki, bürokrat, mühafizəkar üslublar uğursuz üslublardır. Qeyri-sabit üslub isə idarəedənin savadsızlığını meydana çıxarır. Tədqiqatçıların fikrincə, ən uzunömürlü üslub liberal idarəetmədir. Lakin bu üslubun özü də keyfiyyət və nəticələrin alınmasında faydalılıq baxımından qənaətləndirici deyil. Dünyada qəbul olunan və müsbət dəyərləndirilən üslub demokratik idarəetmədir.

İdarəetmə bir sıra funksiyanı yerinə yetirir. Buraya ilk planda layihələndirməni, təşkiletməni, nəzarəti, monitorinqi və qiymətləndirməni daxil etmək olar. Son zamanlar menecerlik bacarıqlarının da məktəbi idarəetmədə əhəmiyyət daşıdığı qeyd edilir. Düşünürəm ki, bu funksiyalar haqqında hamıya bəlli olduğu üçün ayrıca danışmağa ehtiyac yoxdur. Sadəcə bildirmək istərdim ki, idarəetmə fəaliyyətində də nəzarət və monitorinq ciddi əhəmiyyətə malikdir.

Əvvəldə qeyd etdiyim kimi, məktəbi idarəetmə nəzəri biliklərlə yanaşı, zəngin təcrübəyə malik olmağı tələb edir. Bu hər iki cəhət idarəetmənin prinsiplərini düzgün müəyyənləşdirməkdə idarəedənə yardımçı olur. İdarəetmə prinsiplərini düzgün müəyyənləşdirmədən, onun  sağlam, şəffaf və uğurlu olacağına əmin olmaq mümkün deyildir.

İdarəetmənin prinsipləri hansılardır? Onların sayının dəqiq müəyyənləşdirilməsi hələ meydanda yoxdur. Mənə görə, həmin prinsiplərə aşağıdakılar daxildir:

Məqsəd birliyi prinsipi;

Səlahiyyət və məsuliyyət tarazlığının gözlənilməsi prinsipi;

Ədalətlilik və obyektivlik prinsipi;

Qayğı və tələbkarlıq prinsipi;

İşçilərin fərdi xüsusiyyət və qabiliyyətlərinin nəzərə alınması prinsipi;

İcrada qanunların aliliyinin həyata keçirilməsi prinsipi;

Sosial mühit və yuxarı göstərişlərlə tarazlıq prinsipi;

Müasir texnoloji imkanlardan istifadə prinsipi;

Qrup və kollektivlərin əhvali–ruhiyyəsinin nəzərə alınması və yüksəldilməsi prinsipi;

Qərarvermədə mahiyyətin düzgün aşkarlanması və optimal qərarın verilməsi prinsipi;

Məktəbi idarəetmənin və ayrı–ayrı iradəetmə funksiyası daşıyanların düzgün seçilməsi prinsipi.

Bir neçə kəlmə məktəbi idarəetmənin roluna dair qeyd etmək istərdim. Məktəbi bələdliliklə, səriştəliliklə, elmi-nəzəri və təcrübi hazırlıqla idarəetmə: Sağlam kollektivin formalaşmasını təmin edir; Şagirdlərin müasir səviyyədə bilik, bacarıq və vərdişlərə yiyələnməsi və inkişafını təşkil edir və ona nail olur; Qabaqcıl təcrübənin yaranmasını təmin edir; Cəmiyyətin inkişafına yardımçı ola biləcək hazırlıqlı gənclər yetişdirir və s.

Amma burada bir vacib şərt unudulmamalıdır: Əgər idarədən düzgün seçilməzsə, irəlidə qeyd edilən tələb və prinsiplər yerinə yetirilməzsə, məktəbdə formalizm və neqativ hallar mövcud olarsa, bu cür idarəetməni normal hesab etmək olmaz.

Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası sənədinin əsas hədəflərindən biri təhsili, o cümlədən məktəbi idarəetmə işini təkmilləşdirmək və yeniləşdirməkdir. Artıq mexanizmlər hazırlanıb, Fəaliyyət Planı təsdiqlənib. Düşünürəm ki, qarşıda dayanan böyük işləri görmək üçün indiyəqədərki zəngin təcrübəyə və elmi-nəzəri biliklərə bələd olmaq, onlardan faydalılıq mövqeyindən bəhrələnmək lazımdır.

## İstifadə edilmiş ədəbiyyat

1. “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”. //Azərbaycan məktəbi, 2013, №5.

2. “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı”.//Azərbaycan məktəbi, 2015, №1.

3. Cabbarov M. Təhsil dövlət siyasətinin prioritetləri sırasında ilk yerlərdən birini tutur. “Azərbaycan” qəzeti, 2015, 1 mart.

4. Ağayev Ə. Seçilmiş pedaqoji əsərlər. 1-ci cild. Bakı: Mütərcim, 2011.

5. Əlizadə Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı, 2004.

А.Агаев

### О теоретических и практических задачах управления школой

Резюме

В статье говорится о теоретических и практических задачах управления школой. Вниманию предлагаются формы, стили, функции управления школой. Показывается практическая польза развития независимого действия управленческих структур. Отмечается важность использования опыта в усовершенствовании и обновлении, являющегося одним из важных целей Государственной Стратегии - управления образованием.

A.Agayev

### School governance theoretical and practical issues

Summary

The article is dedicated to the theoretical and practical issues of school governance. The forms, styles and functions of school governance are noted here. The importance of improving management and renewal of education is emphasized as declared in the National Strategy for the Development of Education in Azerbaijan.



*2



# ALİ TƏHSİL, MƏZUN VƏ ƏMƏK BAZARI

**Əfqan Abdullayev,**
***professor, Təhsil Nazirliyi Hüquqi Ekspertiza və Lisenziyalaşdırma Şöbəsinin baş məsləhətçisi, iki dəfə (1998, 2005) ABŞ-ın Senator Fulbrayt proqramının mükafatçısı***

Qloballaşan dünyada ölkələr arasında rəqabətin gündən-günə daha da güclənməsi, sürətli texnoloji irəliləyiş nəticəsində ixtisas profillərinin tez-tez dəyişməsi təhsilin keyfiyyətinə tələbi daha da artırmışdır. Bu da qabaqcıl beynəlxalq təcrübə əsasında təhsilin pillələri və səviyyələri üzrə keyfiyyət standartları və göstəricilərinin hazırlanması, təhsilin keyfiyyətinin təminatı üzrə yeni sistemin yaradılması zərurətini gündəmə gətirmişdir.

Son illərdə təhsilə dair qəbul olunmuş bütün sənədlərdə (“Təhsil haqqında” Azərbaycan Respublikasının Qanunundan (2009-cu il) tutmuş, "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" (2013-cü il) da daxil olmaqla) təhsilin keyfiyyəti məsələsi prioritet bir məsələ kimi öz əksini tapmışdır. Məhz həmin sənədlərdə qeyd olunur ki, təhsilin keyfiyyət səviyyəsi ölkədə qəbul olunan dövlət təhsil standartları əsasında beynəlxalq və ümumavropa təhsil sisteminin prinsiplərinə uyğunlaşdırılaraq təhsil pillələri üzrə müvafiq keyfiyyət göstəriciləri sisteminə (təhsil proqramları, abituriyentlərin hazırlıq səviyyəsi, maddi-texniki baza, infrastruktur, informasiya resursları, təhsilverənlərin peşəkarlığı və elmi-pedaqoji səviyyəsi, mütərəqqi tədris texnologiyaları və s.) uyğun olaraq müəyyən edilir. Eyni zamanda o da vurğulanır ki, təhsil müəssisəsində kadr hazırlığının keyfiyyət səviyyəsi məzunların milli və beynəlxalq əmək bazarında rəqabət qabiliyyəti, ölkənin sosial və iqtisadi inkişafında rolu ilə müəyyən edilir. Təhsilin keyfiyyət səviyyəsi hər bir tarixi mərhələdə ictimai-siyasi, sosial-iqtisadi, elmi və mədəni inkişafla bağlı tələblərdən irəli gəlir və akkreditasiya xidməti tərəfindən müvafiq qaydada qiymətləndirilir.

Respublikamızın vahid Avropa məkanına inteqrasiyası bütün sahələrdə olduğu kimi ali təhsil sahəsində də inamla davam etdirilir. Avropa İttifaqı ilə geniş, qarşılıqlı əlaqələr, 2005-ci ildən Boloniya prosesinə qoşulma və digər addımlar onu deməyə əsas verir ki, atılmış addımlar yaxın gələcəkdə öz nəticələrini verəcəkdir. Bu da çox başa düşüləndir. Qloballaşan dünyada, internet dövründə təcrid olunaraq tək yaşamaq, demək olar ki, mümkün deyil. Təcrid olunaraq yaşamaq həm təcrid olan üçün, həm də qlobal dünya üçün xeyir gətirmir. Hər iki tərəf (bəlkə də, birinci tərəf daha çox) itirmiş olur.

Birləşmiş Millətlər Təşkilatı XXI əsri “Təhsil əsri” elan etmişdir. Bu, məhz o zərurətdən irəli gəlib ki, yüksək intellektə malik insan kapitalının formalaşmasında, davamlı inkişafa zəmin yaradan güclü iqtisadiyyatın qurulmasında ali təhsilin rolu inkaredilməzdir. Bu gün dünyanın ABŞ, Çin, Almaniya, Cənubi Koreya, Yaponiya

kimi inkişaf etmiş ölkələri öz güclü iqtisadiyyatlarına görə məhz təhsilə, xüsusilə ali təhsilə borcludurlar. İnkişafa təsir göstərən amillər içərisində təhsilin çəkisi təxminən 70 % təşkil edir. Burada ulu öndər Heydər Əliyevin “Təhsil millətin gələcəyidir!” deyimi də bir daha yerinə düşür.

Boloniya bəyannaməsinin əsas hədəflərindən biri də hər bir ali məktəbdə təhsilin keyfiyyətinin təmini və ona nəzarət mexanizminin təşkilidir. Məhz bu hədəf Vahid Avropa Ali Təhsil Məkanının yaradılmasında Azərbaycan ali məktəbləri üçün təhsilin səviyyə və keyfiyyətini diqqətlə nəzərdən keçirmək üçün bir əsas olmalıdır. Bu, əlbəttə, çətin bir yol olsa da, bizdən dövlətin və Təhsil Nazirliyinin bu sahədəki strategiyasını yenidən öyrənməyi və dərk etməyi tələb edir. Bu istiqamətdə atılan addım Azərbaycan reallıqları şəraitində qərb sosial texnologiyalarının tətbiqi ilə, onu öz məzmunu ilə doldurmaqla Azərbaycan ali təhsilinə Avropa ali təhsil məkanına tam inteqrasiya imkanı verəcək.

Vahid Avropa Ali Təhsil Məkanına inteqrasiyaya gedən yol mütləq keyfiyyətin təmin olunmasından, keyfiyyətin təminatına nəzarət mexanizminin yaradılmasından keçir. Bu günə kimi bu sahədə mövcud təcrübələrdən söhbət düşəndə, ilk növbədə ABŞ, Böyük Britaniya, Almaniya, Fransa kimi ölkələrin keyfiyyətin təmin olunmasında istifadə etdikləri modellər daha çox diqqət çəkir. Böyük Britaniyada bu sahədə tətbiq olunan model, əsasən, akademik göstəricilərin universitetdaxili qiymətləndirilməsinə əsaslanır. Fransada tətbiq olunan modeldə universitetxarici qiymətləndirmə əsas kimi götürülür. ABŞ modelində isə təhsil müəssisəsinin və təhsil proqramlarının müstəqil akkreditasiya orqanları tərəfindən qiymətləndirilməsi nəzərdə tutulur.

Heç şübhəsiz ki, bu modellərlə yanaşı, təhsilin keyfiyyətinin idarə olunması sisteminin yaradılması yeni idarəetmə texnologiyalarının tətbiqini də mütləq surətdə gündəmə gətirir. Əsas diqqət texnoloji proses kimi keyfiyyətin idarə olunması sisteminin tətbiqinə yönəldilir, məqsəd isə universitetin əsas iş proseslərində keyfiyyətli təhsilin təmin olunmasına şərait yaradan mexanizmin yaradılmasıdır.

Keyfiyyətin ümumi idarəedilməsinin fəlsəfəsi bundan ibarətdir ki, bu yalnız effektli idarəetmə metodu deyildir. Bu eyni zamanda, hər şeydən əvvəl, dünyagörüşü, insanlar arasında idarəetmə sistemidir, menecment elmidir. Burdan da belə qənaətə gəlirik ki, keyfiyyətin təmin olunması sisteminin tətbiqi yalnız ali təhsil müəssisəsinin bütün heyətinin bu prosesi anlamasından sonra öz nəticəsini göstərəcək. Əlbəttə, bu işdə vicdan amilini də heç şübhəsiz ki, yaddan çıxarmaq olmaz.

Keyfiyyətin təmin olunmasının əsasında Keyfiyyətin Ümumi İdarəsinin ardıcıl hərəkəti prinsipi dayanır. Bu, “planlaşdır-həyata keçir-öyrən-qiymətləndir-hərəkət et-təkmilləşdir” prinsipi deməkdir. Bunları ümumiləşdirərək keyfiyyətin idarə olunmasının ümumi prinsiplərini aşağıdakı kimi müəyyən edə bilərik:

1) Proseslərin menecmenti
2) Cəmiyyət qarşısında cavabdehlik, məsuliyyət hissi
3) İstehlakçı tərəfə meyillilik
4) Nəticə və məqsədə doğru meyillilik
5) Professor-müəllim heyətinin cəlb edilməsi, iştirakı və motivasiyası
6) Korporativ əməkdaşlığın inkişaf etdirilməsi
7) Heyətin daimi təlimi, innovasiyaların tətbiqi
8) Qətiyyətli rəhbərlik-menecment

Fikrimizcə, bu prinsiplər arasında prioritet olanlar “proseslərin menecmenti”, “korporativ əməkdaşlığın inkişafı”, “savadlı,

səviyyəli-kompotent əməkdaşların cəlb olunması, iştirakı və motivasiyası", "istehlakçıya meyillilik" prinsiplərini göstərmək olar. Elə isə keyfiyyətin ümumi idarəsinin əsas elementlərinə nələri aid etmək olar?

1) Bütün əməkdaşların prosesə cəlb olunması

2) İdarə edən – idarə olunan arasında qarşılıqlı münasibətin yaranması

3) Səlahiyyətin iyerarxiyası, yuxarıdan aşağıya, güclü bənddən zəif bəndə ardıcıllıqla ötürülməsi

4) İşə görə yeni mənəvi və maddi stimulun verilməsi

5) Yeniliklərin qəbulu üçün psixoloji baryerlərin aradan qaldırılması.

Ali məktəb özü konkret olaraq öz işinə görə istər dövlət, istərsə də cəmiyyət qarşısında tam məsuliyyət daşıyır. Bu korporativlik universiteti xaricdən vadar edilən sərt dağıdıcı fəaliyyətlərdən də qoruyur. Hər bir ali məktəb – texniki və ya klassik anlamda universitet keyfiyyətin ümumi idarə prinsiplərini öz spesifik şəraitlərinə və xüsusiyyətlərinə uyğunlaşdırmalıdır.

Təhsildə keyfiyyətin idarə olunması sistemi həmişə proseslərin strukturunun qurulması və texnologiyaların yaradılması ilə birbaşa bağlı olan bir prosesdir. Bu gün bu işə cəlb olunan ali məktəblərimizdə kollektivin sosial-psixoloji mühitində dəyişiklik aparmaqla yeni sosial texnologiyaların üzə çıxmasını gözləyə bilərik. Universitetin intellektual məhsulunun keyfiyyəti birbaşa olaraq onun buraxılması prosesində iştirak edənlərdən, universitetin bütün əməkdaşlarından asılıdır.

Bu gün ali təhsildə keyfiyyətin idarə olunması sahəsində mövcud vəziyyəti təhlil edərkən ali məktəblərimizi təhsildə keyfiyyətin təmin olunması texnologiyasının tətbiqinə görə bir neçə qrupa bölmək olar:

1) Keyfiyyət (bəzən Beynəlxalq Keyfiyyət) sertifikatı alan ali məktəblər

2) Keyfiyyət sistemini təsdiqləməyə hazırlaşan ali məktəblər

3) Keyfiyyət sistemini yaradan, lakin onun təsdiqlənməsinə can atmayan ali məktəblər

4) Keyfiyyət sisteminin ayrı-ayrı elementlərinin tətbiqinə başlayan ali məktəblər

5) Keyfiyyət sisteminin tətbiqi prosesinə başlamaq ərəfəsində olan ali məktəblər.

Maraqlıdır ki, təsdiq edilmiş keyfiyyət sistemlərinin mövcudluğu həmişə onun ali məktəbdə, doğrudan da, fəaliyyət göstərməsini heç də təsdiq etmir. Bundan başqa, öz keyfiyyət sistemini təsdiq etmək və ya etməmək isə ali məktəbin öz işidir.

Təhsilin keyfiyyətindən danışdıqda onu şərtləndirən dörd əsas faktoru da yaddan çıxarmamalıyıq:

1) Təhsilə qoyulan sərmayənin həcmi

2) Müəllimlərin professional səriştəliliyi – kompotentliliyi

3) Abituriyentlərin hazırlıq səviyyəsi

4) Təhsilin məzmunu

Bu sahədə mövcud vəziyyətlə əlaqədar uzun-uzadı fikir söyləmək, təhlillər aparmaq olar. Amma bircə məsələ hamımıza gün kimi aydındır ki, cəmiyyətin mövcud intellektual və mənəvi potensialını özündə cəmləşdirən universitetlər təhsilin keyfiyyətini artırmaqla, keyfiyyəti təmin etməklə mövcud durumu dəyişdirə bilərlər. Burada keyfiyyətin idarəsi texnologiyalarından istifadə etmək çox vacibdir.

Keyfiyyətin təminatı sisteminin yaradılması istqamətində işləyən bütün ali məktəblərin özünü də, əsasən, iki qrupa bölmək olar:

1) Keyfiyyətin təminatı işinin təşkilinə cəhd göstərən ali məktəblərdə o qədər də çox iş görülməmişdir (bəzilərində isə heç bir iş görülməmişdir). Ən yaxşı halda keyfiyyətin təminatı adlı mərkəz açıblar,

keyfiyyətə nəzarət edən sistemin özü isə yoxdur.

2) Keyfiyyətin təmin olunması texnologiyasını real tətbiq edən məktəblər.

Keyfiyyətin təmini sisteminin yaradılmasında mövcud olan təcrübədən çıxış edərək bəzi problemli məqamları da nəzərə çatdırmaq istərdik:

1) Yüksək təhsil idarəçilərinin (rektor, prorektor, dekanlar) Keyfiyyətin təmin olunması sisteminin tətbiqində bugünkü reallıqları, rəqabət mühitini nəzərə almamaları

2) Bu prosesə düşüncə tərzi fərqli olan (dövrə, zamana uyğun olan) kadrları cəlb eləmək zərurəti. Bu sistemin mahiyyəti aydın dərk olunmalıdır. Başa düşülməlidir ki, bu həm maddi xərc, həm də mənəvi sərf tələb edir (Əslində ikinci daha çətindir, çünki bu eyni zamanda dünyagörüşünün dəyişilməsi məsələsidir).

3) İdarəetmə üslubunun dəyişdirilməsi. Texnologiyaların tətbiqi, eyni zamanda ali məktəbin idarə üslubunun avtoritar elementlərinin texnoloji elementlərlə əvəz edilməsi deməkdir. Bir qayda olaraq, ali məktəblərdə prosesi tənzimləmək işini qabaqcıl idarəetmə texnologiyalarını mənimsəyən insanlar başlayır.

4) Və əsas məqam – bu prosesi başlayanların keyfiyyət ideyasını, mahiyyətini dərk eləyənə qədər keyfiyyət sisteminin tətbiqi ilə məşğul olması məsləhət deyil. Bu, ən vacib məsələdir. Keyfiyyətin təminatı sisteminin tətbiqinin əvvəlində yaxşı ideoloji işin yoxluğu bu proseslərin ali məktəblərdə illərlə zəif effektli olmasının əsas səbəbidir.

Unutmaq olmaz ki, ali təhsil sistemində rəqabətli mübarizəyə hazır ali məktəblərlə digərləri arasında sərhəd zaman-zaman daha aydın görünməkdədir. Bu gün ali təhsil idarəçiləri üçün ali təhsil problemini həll etmək sanki riyaziyyatçı üçün Ferma teoremidir – çətin, lakin hədsiz dərəcədə maraqlı bir iş! Vacib olan isə budur ki, gərək problemin həllinə düzgün yanaşasan, strategiya yaradasan və doğrudan da işlə məşğul olasan. Burda bir məsələ də yaddan çıxmamalıdır ki, ali təhsil haqqında müasir diplom statusunun dəyəri getdikcə düşür. Bu gün işə götürən təcrübəsiz ali təhsil məzununu deyil, iş təcrübəsinə malik olan mütəxəssisi böyük məmnuniyyətlə işə dəvət edir.

Onda bəs necə etməli? Ali təhsildə keyfiyyəti necə qaldırmalı? Hal-hazırda ali təhsil sistemi ilə (təkcə ali təhsil sistemi ilə yox) əmək bazarı arasında uyğunsuzluq genişlənir. Bu, təkcə Azərbaycanın deyil, eləcə də Avropanın, Amerikanın, hətta Çinin də problemidir. O, inkişaf etmiş təhsil sisteminin də mövcud olduğu və iqtisadiyyatın strukturunun tez-tez dəyişdiyi hər yerdə yaranır. Səbəbi isə ondadır ki, əmək bazarı çox dinamik inkişaf edir, təhsilə nisbətən daha çevikdir, yeni-yeni tələblər yaranır, hətta mütəxəssis anlayışı da dəyişir. Təhsilin təbiətində isə, adətən, bir mühafizəkarlıq var. Universitetlər, məktəblər öz ənənələrini, uzun illərdən bəri formalaşmış külturlarını, standartlarını saxlamağa çalışırlar. Demək, uyğunsuzluq qaçılmaz olur. Sadəcə onu dramatikləşdirməyə ehtiyac yoxdur. Bu gün ali məktəb məzunlarının çoxunun öz ixtisası üzrə işləməməsi təbii tendensiyadır. Amma bu uyğunsuzluq çox böyükdürsə, onda problemlər başlanır, işə götürən şikayətlənir, təhsilin paralel sistemləri yaradılır – kadrların hazırlanması üçün korporativ proqramlar, hətta korporativ universitetlər yaranır, beləliklə də, diplom rəsmiyyətə çevrilir, peşəkar hazırlıqdan daha çox sosial status simvolu olur. Əsas məsələ isə təhsil sistemini əmək bazarının dəyişən şəraitinə yaxınlaşdırmaqdır. Bəlkə də, fərdi təhsil trayektoriyasına keçməyin vaxtı artıq çatıbdır! Yəni tələbə ilk günlərdən harada işləyəcəyini (hansı sahədə), nə ilə məşğul olacağını, karyerasını necə quracağını nəzərə

alaraq öz "təhsil trayektoriyasını" (təhsil dairəsini) müəyyənləşdirir. O, fənləri, seminarları özü seçir, alacağı biliyə görə özü məsuliyyət daşıyır. Bu, əlbəttə ki, ideal vəziyyətdir, buna keçmək üçün isə biz çox yol getməliyik.

Qeyd etmək lazımdır ki, hazırda Təhsil Nazirliyi tərəfindən həyata keçirilən "SABAH" layihəsi ali təhsildə tədrisin keyfiyyətinin yüksəldilməsi, ali təhsil sistemində yeni və fərqli bir mühitin yaradılması, savadlı, bacarıqlı və hazırlıqlı tələbə yetişdirilməsi, əmək bazarının artan tələblərinə müvafiq olaraq kadr hazırlığının təmin edilməsi məqsədilə yaradılmışdır. Bu layihə tələbələrə bir sıra üstünlüklər, o cümlədən əlavə müavinət, pulsuz yaşayış yeri və qidalanma, tələbə mübadiləsi proqramlarında iştirak, intellektual və yaradıcı potensialın inkişafı, müasir şirkətlərdə iş təcrübəsi və əlavə təhsil kimi üstünlükləri təmin edir.

Boloniya prosesinin aşkar faydasına baxmayaraq, onun tələblərini tam qəbul etmək XX əsrin sonunda ali təhsil sisteminin əsaslandığı ənənələrin, demək olar ki, əksəriyyətindən əl çəkmək deməkdir. Amma onu da yaddan çıxarmaq lazım deyil ki, Boloniya prosesi qanun deyil, fəaliyyət üçün bələdçidir. Əgər Boloniya prosesinə rəsmi tələblər toplusu kimi baxsaq, belə tələbləri mexaniki olaraq tətbiq etsək, yaxşı heç nə əldə etmək mümkün olmayacaq. Bununla belə, Boloniya prosesi kifayət qədər demokratik bir prosesdir – hər bir ali məktəb özü üçün müəyyənləşdirməlidir ki, bu prosesdə hansı miqyasda və formada iştirak edəcək. Önəmli olan isə başqa məsələdir – XXI əsr təhsili XX əsr təhsilindən köklü surətdə fərqlənəcək!

## İstifadə edilmiş ədəbiyyat

**1. "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası". //Azərbaycan məktəbi, 2013, № 5.**

**2. "Təhsil haqqında" Azərbaycan Respublikası Qanunu.// Azərbaycan məktəbi, 2002, № 6.**

**3. "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı". //Azərbaycan, 2015, 20 yanvar.**

**4. Cabbarov M. Təhsil dövlət siyasətinin prioritetləri sırasında ilk yerlərdən birini tutur. //"Azərbaycan" qəzeti, 2015, 1 mart.**

**5. Тайхлер У. Многообразие и диверсификация высшего образования: тенденции, вызовы и варианты политики. Вопросы образования, 2015, № 1.**

**А.Абдуллаев**

**Высшее образование: выпускник и трудовой рынок**

**Резюме**

**В статье говорится о Болонской системе в области высшего образования, о влиянии его на качество образования, о подготовке высококачественных специалистов, об адаптации образовательной системы к трудовому рынку.**

**Также затронуты вопросы о предпринятых шагах в этой области.**

**A.Abdullayev**

**Higher education, graduates and labour market**

**Summary**

**The article is dedicated to joining to Bologna process in higher education, its impact on the quality of education, general principles of quality management, preparation of qualified professionals, adapting education system to labour market and other issues.**



# MƏKTƏBDƏ İNSAN RESURSLARININ İDARƏ OLUNMASI

**Almaz Əsgərova,**
***Bakı şəhəri, 220 nömrəli tam ota məktəbin direktoru, əməkdar müəllim***

***Açar sözlər:** resurs, idarə, təhsilverən, təhsilalan.*
***Ключевые слова:** ресурс, управление, преподаватель, учащийся.*
***Key words:** resourses, managing, teacher, student.*

Ölkəmizdə təhsil islahatlarının həyata keçirilməsi gedişində kadr və intellektual potensialın, məktəb sisteminə daxil olan insan resurslarının möhkəmləndirilməsi prioritet sahələrdən biri kimi çıxış edir. Ona görə də bu sahə həmişə diqqət mərkəzində saxlanılır. “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı”nda ümumtəhsil müəssisələri müəllimlərinin peşəkarlıq səviyyəsinin artırılması üçün yeni metodların hazırlanması və tətbiqinin, bütün təhsil pillələri üçün innovativ təlim metodologiyasının və müvafiq texnologiyaların tətbiqi məqsədi ilə tədbirlərin görülməsi də insan resurslarının idarə olunması ilə əlaqələndirilir. Deməli, təhsilverənlərin peşəkarlıq səviyyəsinin daim yüksəldilməsini təmin edən yeni sistem – mexanizm də bu məqsədi güdür.

Qlobal vəzifələrin reallaşması yolları idarəetmənin düzgün, şəffaf, səmərəli qurulması, insan resurslarının idarə olunmasının effektivliyini zəruri edir. İnsan kapitalı öz dəyərini nəinki saxlamalı, hətta qat-qat artırmalıdır.

Tədris müəssisəsində insan resurslarının idarə olunması, hər şeydən əvvəl, məktəbdə müəllimlərin ixtisası üzrə yerləşdirilməsi, kadrların peşəkarlığının artırılması, iş şəraiti, şəxsi inkişaf, işin icrasının qiymətləndirilməsi və başqa məsələlərdən çox asılıdır.

Müasir məktəb şagirdlərə xidmət edir. Lakin bu məqsədə çatmaq üçün yüksəkixtisaslı müəllim potensialının olması zəruri şərtlərdəndir. Ona görə də insan resurslarının idarə olunmasından danışarkən, söhbətin məğzini, ilk növbədə hazırkı və gələcək kadr ehtiyaclarının müəyyən edilməsi, kadrların düzgün seçilməsi və işə götürülməsi, həvəsləndirilməsi, onların iş yerində sabitləşdirilməsi, vaxtaşırı treninqi, inkişafı kimi problemlər təşkil edir. Son illərə qədər məktəblər üçün müəllimlərin seçilməsi və təyin edilməsi məktəb direktorlarının səlahiyyətində idi. Belə olduqda məktəb rəhbəri müəyyən təsirlərdən, subyektivlikdən uzaq ola bilmirdi. İndi isə ümumtəhsil məktəblərinin kadr təminatı, seçimi və təyinatı mərkəzləşdirilmiş formada Təhsil Nazirliyi tərəfindən aparılır. Aydındır ki, bu qayda heç də məktəb rəhbərinin bu sahədən kənarlaşdırılması kimi düşünülməməlidir. Çünki yenə də yerlərin düzgün müəyyənləşdirilməsi, sifarişlərin dürüstləşdirilməsi, onlar üçün vaxtında sifariş verilməsi məktəb rəhbərlərinin üzərinə düşür. Onun cavabdehliyi yerində qalır.

Məktəbdəki insan resursları ilə də müntəzəm olaraq məktəbin rəhbərləri məş-

ğul olmalıdır və buna təhsilimizin aparıcı problemi kimi baxılmalıdır. Məktəbdə insan resurslarının səmərəli idarə olunması yalnız təhsilimiz haqqında aydın təsəvvürün olduğu mühitdə mümkündür.

Unutmaq olmaz ki, bu işdə məktəb rəhbərinin yalnız bilik və bacarıq səviyyəsinin yüksək olması kifayət deyildir. O, təlim prosesinin hər bir mərhələsindən xəbərdar olmaqla yanaşı, fənn kurikulumlarının tətbiqini yaxından izləməli, hər müəllimə tövsiyələr verməyi bacarmalı, istər müəllimlərin işinin monitorinqində, istərsə də şagirdlərin bilik və bacarıqlarının qiymətləndirilməsində obyektiv mövqedə durmağı, səriştəlilik göstərməyi özünün mənəvi borcu bilməlidir. Rəhbərin şəxsiyyəti təlim-tərbiyə prosesində təşkilatçı-lider təsirini bağışlamalıdır.

İndi təhsil cəmiyyətin ən prioritet sahələrindən biridir. Çünki təhsil cəmiyyətin inkişafını təmin edən həlledici amildir. Bütün insanlar, ancaq təhsil mərhələsindən keçməklə formalaşır. Cəmiyyət də inkişafa təhsillə başlayır və onun müntəzəm davam etdirilməsi mövqeyində durur. Çünki öyrənmək və öyrətmək ehtiyacı təhsilin yaranmasına və inkişafına zəmin olmuşdur. Bir sıra zəruri problemlərin meydana çıxması və daim təkmilləşmək tələbatı bu günün təhsil sisteminin yaranmasına qədər davam etmiş və etməkdədir. Lakin bu sistem indiyədək heç zaman belə çətin problem qarşısında qalmamışdır; nəyi öyrədək, necə öyrədək, bu öyrənmə mərhələləri necə sıralanmalıdır? Nəzərə almaq lazımdır ki, təhsilverənlərin böyük əksəriyyəti indiyədək ənənəvi metodlarla işləmişdir. Yeni metodlara yiyələnmək isə elə adi məsələ deyildir.

Bundan əlavə, məktəbin bir vəzifəsi də mədəni irsi formalaşdıran dəyərləri öyrətməkdir. Zamanın sürətinə uyğunlaşması üçün hər yerdə İKT-nin zəruriliyi qəbul edilir. Çünki sürətli texniki inkişaf buna hazır olmayan cəmiyyəti öz arxasınca kortəbii surətdə aparır. Eyni vaxtda zaman adlandırdığımız məfhum paralel olaraq özünə lazım olan insan resurslarını yaradır. Yenicə dünyaya gəlmiş, hələ oxumağı-yazmağı (təhsili) bilməyən bu kiçicik varlığın beyni təhsildən əvvəl texnikanı mənimsəyir, anlayır, onu idarə etməyə öyrəşir və beləliklə də, onlarda məhz təhsilsiz və təhsilverənsiz yeni bacarıqlar yaranır, inkişaf edir.

İndi təhsilalanlara dünyanın həm mənəvi, həm də maddi reallıqlarını tanıdan biliklər verilməlidir. Uşaqlara hər zaman və hər yerdə qüvvədə qalacaq, əhəmiyyətini itirməyəcək biliklər aşılanmalıdır.

Bax belə bir mühit və şəraitdə təhsilverənlərin davamlı təkmilləşdirilməsi ən aktual bir məsələ kimi öz həllini gözləyir. Təhsilin məqsədi insanı inkişaf etdirmək olmalıdır. Təhsildə insanın zehni inkişafı, intellektual səviyyəsi son dərəcə vacibdir. Bu yeni məzmun üzərində qurulan, yeni düşüncə tərzi tələb edən, yeni yanaşmaları formalaşdıran, texniki bacarıqları özündə ehtiva edən təlimlərin, treninqlərin, kursların və seminarların təşkilini də belə vacib bir məsələyə çevirir. Bu gün fəaliyyətdə olan müəllim də bilməldir ki, hər gün öyrənməsə, nələrsə yarımçıq qalar, tam başa çatdırılmaz. Buna görə də müəllimlərin ixtisasartırması və təkmilləşdirilməsi müasir təhsil sistemindəki dəyişiklik qədər vacib bir məsələ kimi meydana çıxır.

Təhsilin müxtəlif formalarının (ənənəvi, sərbəst, distant, inklüziv...) meydana çıxdığı bir zamanda təhsilverənin ixtisasının təkmilləşdirilməsi istiqamətləri də şaxələnir, çoxalır. O da öz növbəsində yeni mexanizm tələb edir.

Təhsil prosesində insan resursunun - təhsilverənin iştirakı mütləqdir. Çünki təhsil həmişə özündən əvvəlki təcrübəyə əsaslanaraq zənginləşir və inkişaf edir. Bu isə yalnız planlaşdırma və proqramlaşdırma

əsasında həyata keçirilir. Lakin bizə məlum olan təhsil formalarının bəzilərində təhsilverənin bir başa iştirakına ehtiyac qalmır. Bu da artıq bir çox sualların yaranmasına səbəb olur.

Burada təhsilverənin bu gün hansı bilik və bacarıqlara malik olması da sual doğurur. Qəribədir ki, mürəkkəb texnikanı idarə etməyi bacaran təhsilalan subyektin ona verdiyi ən sadə bilikləri çətinliklə qavrayır və mənimsəyir. Bunun isə müxtəlif səbəbləri vardır: hər gün yeniləşən texnologiyanı bilmək sosial tələbatdır; uşaq onu özü öyrənir, çünki münbit mühit var. Hətta bacarıqları ilə böyükləri heyrətləndirir və lazım olanda kömək də edə bilir. Subyektin təhsilalana öyrətdiyi könüllü deyil, məcburidir, bu bir növ şəxsi fikirlərə, düşüncəyə təzyiq kimi səslənir, başqasının-təhsilverənin şəxsiyyət üzərində hakimiyyəti və zorakılığı kimi görünür. Məhz buna görə də hazırda yeni elmi metodologiyanın əsasında təhsil mühitinin maraqlı, cəlbedici olması üçün müxtəlif tədqiqat və araşdırmaların aparılması daha çox diqqəti cəlb edir.

Müəllimin ixtisasının artırılmasından, peşəkarlığından çox yazılsa da, müasir peşəkar müəllim xarakteri, xüsusiyyətləri haqqında tədqiqatlar lazımi səviyyədə deyildir. Uşaqlarla, onların valideynləri ilə pedaqoji əməkdaşlıq şəraitində işləyən müəllimin peşəkarlıq xüsusiyyətləri öyrənilməli, onların bu sahədəki fədakarlığı, məsuliyyətliliyi, qayğıkeşliyi və xarizmatikliyi, öz ixtisasını əla bilməsi müəllimin mənəvi keyfiyyətləri kimi əsas komponent olaraq həmişə diqqət mərkəzində saxlanılmalıdır.

Müəllim şərəf və dürüstlüyün simvolu olmalıdır. Məktəb hər bir müəllimdən bunu gözləyir. Burada köməyə gələn amillərdən biri də müəllimin etik normalarıdır.

O da aydındır ki, yeni texnologiyalar məktəbə çox gec, vaxtı keçmiş halda gəlib çıxır. Sözsüz ki, bunun çox müxtəlif səbəbləri vardır. Bəziləri bilavasitə təhsil müəssisələri ilə bağlıdır. Çünki elm mərkəzləri ilə təhsil müəssisələri arasında əlaqə zəifdir. Cəmiyyətə birbaşa ötürülən yeni texnologiyalar təhsilə o vaxt gətirilir ki, o artıq cəmiyyətdə aktuallığını itirmiş olur. Köhnəlmiş, məktəbə yenilik kimi təqdim olunan bu texnologiyalar öyrənilib, öyrədilənə qədər texniki inkişaf bunu qabaqlayır və hətta ötüb keçir.

Dünyada qəbul olunmuşdur ki, istənilən dövlətin inkişafı onun təhsil sisteminin keyfiyyətindən asılıdır. Keyfiyyətin təmin edilməsi üçün: yaxşı müəllimlər, yüksək mənəvi dəyərlər, əla imtahan nəticələri, valideynlərin, ictimaiyyətin dəstəyi, geniş resurslar, müasir texnologiyanın tətbiqi, güclü və məqsədyönlü liderlik, şagirdlərin qayğısına qalan məktəb, balanslaşdırılmış və mükəmməl tərtib olunmuş kurikulum və b. zəruridir.

Ona görə də bu gün təhsilalan üçün bunların bir çoxu maraqlı deyil, darıxdırıcıdır, yorucudur. Amma onlar bilməlidirlər ki, kortəbii bacarıqlar da təhsil deyildir. Bacarıqların elmi əsası və təhlili olduqda savadlılıq və ziyalılıq yaranır. Buna görə də təhsil sisteminin səmərəli qurulması vacibdir və zəruridir. Artıq yeni yanaşmaların, yeni düşüncə tərzinin və dəyişikliklərə hazır olan çevikliyin daimi tətbiqi qaçılmazdır.

Ənənəvi məktəb proqramı düşüncəni yox, təkrarı, əzbərləməni aşılayır, proqramlar tələbata uyğun gəlmir, sosial sifariş nəzərə alınmır, təhsilin hədəfləri bu günün tələbləri ilə uzlaşmır. Ona görə də hazırda proqramların yenidən işlənməsi, tədris planında dəyişikliklərin aparılması, təhsilin beynəlxalq təhsilə uyğun formalaşdırılması, inteqrativ təhsilin inkişafı bu günün zəruri tələbatıdır və bu iş davam edir.

Təhsildə dəyişiklik məntiqi təfəkkürün inkişafına xidmət edən məzmun kəsb etməlidir. Məntiqə uyğun tapşırıqlar, oyunlar, ça-

lışmalar maraqlı, düşündürücü və əyləncəlidir. Artıq buna aid kifayət qədər materiallarımız vardır.

İbtidai pillədə uşaqlara verilən təhsilin məzmununda məhz məntiqin üstünlük təşkil etməsi davamlı təhsil üçün əsas yaratmalıdır. Sözsüz ki, inkişaf bir qayda olaraq sadədən mürəkkəbə doğru getmişdir.

Təhsil vərdişlərinin yaradıldığı ibtidai pillədən sonra təhsildə elmilik əsas götürülməlidir. Elmi biliklərin tədrisi prosesi isə artıq təbaşirə, müəllimin mühazirəsinə, uzun-uzadı izahına yox, İKT vasitələrindən tam istifadə şəraitində, tədqiqat xarakterli olaraq təhsilalana çatdırılmalı, onun elmin əsaslarını yaş səviyyəsinə uyğun, inkişafın yüksələn xətti ilə, əyani şəkildə öyrənməsinə şərait yaradılmalıdır.

“Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı”nda 2015-2020-ci illərdə təhsil müəssisələrində informasiya-kommunikasiya texnologiyalarının, əsaslı təlim metodologiyasının tələblərinə uyğun infrastrukturun yaradılması, hər bir təhsil müəssisəsinin internetlə, ümumi orta təhsil səviyyəsində hər bir şagirdin elektron dərsliklər yüklənmiş kompyuter-planşetlə təmin olunması nəzərdə tutulmuşdur. Bu gün müəllimlərin ixtisasartırma istiqamətində təkmilləşdirilməsi də bununla birbaşa bağlıdır.

İKT vasitələrindən istifadə edərək hər bir mövzunun tədqiqi, əyani təqdimatı , motivasiya və problem situasiyanın yaradılaraq şagirdin mövzuya cəlbi təmin olunmalıdır. Burada səmərəli nəticə almaq üçün müəllimin yaradıcılığına yox, təhsildə dövlət standartlarının məqsədyönlü tətbiqinə və nəticəyönümlülüyünə diqqət yetirilməlidir. Bunları əldə etmək üçün isə bir an belə ləngimədən fəaliyyətə başlamalı və yaxşı vətəndaş, gərəkli insan yetişdirmək üçün bütün maneələri dəf etməyi bacarmalıyıq. Bu, bizim gələcəyimiz üçün lazımdır.

Qeyd etmək lazımdır ki, təhsillə əlaqədar təqdimatların məktəblərdəki təhsil xidmətlərinin keyfiyyətinə təsir edən müxtəlif amillər vardır. Bu amillərin bir hissəsinə bilavasitə məktəb rəhbəri nəzarət edir, ancaq elə hissələr var ki, onlar birbaşa müəllimlər tərəfindən icra olunmalıdır. Bir sözlə, resurslar aktiv fəaliyyətdə olmalıdır.

Məktəb rəhbəri isə, insan resurslarının təkmilləşdirilməsinə, qiymətləndirilməsinə, motivasiyanın təmin olunmasına məsuliyyət daşıdığı kimi, təlim-tərbiyə prosesinin keyfiyyətinə də cavabdehdir və kollektivi qarşılaşdığı bütün çətinliklərə sinə gərməyə hazırlamalı, onlar məktəbdə insan resurslarının son dərəcə səmərəli istifadə edilməsinə səy etməlidirlər.

Təhsil müəssisəsində insan resurslarının idarə olunmasına elə yeni müəllimin məktəbə qədəm qoymasından başlanmalıdır. Keyfiyyətli tədris prosesi haqqında fikirləşən rəhbər özünün fikir və düşüncələrini tabeliyindəki müəllimlərlə də bölüşməlidir. Hər şeydən əvvəl, müəllimlər üçün yaxşı iş şəraiti yaradılmalıdır. O, müəllim peşəsinin xüsusiyyətlərinin hamı tərəfindən dərk edilməsinə nail olmalıdır. Müəllim isə öz peşəkar bacarıq və biliklərini dərs dediyi şagirdlərə ötürməlidir.

Müəllimin peşəkar inkişafına və treninqinə ardıcıl fikir verilməlidir. Məktəbdə təşkil olunan treninqlərdə təcrübə və fikir mübadiləsi aparılmalıdır. Məktəbdə təşkil olunan seminar və mühazirələr məzmunlu keçirilməlidir.

Rəhbərlik isə görülən işlərin düzgün və obyektiv qiymətləndirilməsinə daimi bir proses kimi yanaşmalıdır.

İnsan resurslarının idarə olunması və onun gündəlik icrası ikitərəfli ünsiyyət əsasında qurulmalıdır. Hər kəsin müəllimlər üçün müəyyən edilmiş etik normalara riayət etməsi əsas prinsip sayılmalıdır. Mü-

əllimlərin öz işinə həvəslə yanaşmaları üçün bütün imkanlardan istifadə edilməlidir. Unudulmamalıdır, başqa nailiyyətlər əldə etmək istəyən müəllimlər qarşılarına çətin, maraqlı məqsədlər qoyur, onların icrasından mənəvi zövq alırlar.

İnsan resurslarının idarə olunması psixoloji amillərlə də sıx bağlıdır. İşçilərin rəğbətləndirilməsi çox önəmli məsələlərdəndir.

Məktəb təcrübəsi göstərir ki, idarəçiliyin düzgün qurulması əldə olunan nəticələrin mayasını təşkil edir. Pedaqoji kollektivdəki məqsəd aydınlığı idarəetmənin uğurunun açarıdır. Sözsüz ki, bu yol onların keyfiyyətlə işləmələrinə öz təsirini göstərməmiş qalmayacaqdır.

Yuxarıdakı problemlərin hər biri pedaqoji kollektivimizi düşündürən məsələlərdəndir. Onlar bu məsələlərin ən səmərəli həlli yollarının tapılması üçün axtarışlar aparır, direktiv sənədlərdə göstərilmiş tələbləri öyrənir və onları əsas götürür, müasir təhsilə xas olan yaradıcılıq axtarışlarını davam etdirirlər. Qeyd etməliyəm ki, bu sahədə bir sıra uğurlarımız da vardır. Artıq məktəbimiz ən qabaqcıl təhsil müəssisələri sırasındadır. Məzunlarımızın ali məktəblərə qəbulu da qənaətləndiricidir. Digər təlim, təhsil göstəricilərimiz də fərəhləndiricidir. Lakin görüləsi işlərimiz daha çoxdur. Onların hamısı məktəbdə insan resurslarının səmərəli istifadəsi ilə sıx bağlıdır. Məktəbdə insan resurslarından səmərəli istifadə edilməsi işə böyük yaradıcılıqla yanaşmağı tələb edir. Bunun üçün təhsil haqqında direktiv sənədləri öyrənməklə yanaşı, məktəb təcrübəsinin ən son nailiyyətlərinin mənimsənilməsi və tətbiqinə ardıcıl fikir verilməlidir.

*Rəyçi: prof. Ə.Ağayev*

## İstifadə edilmiş ədəbiyyat


1. “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”.// Azərbaycan məktəbi, 2013, № 5.
2. “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”-nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı”. //Azərbaycan məktəbi, 2015, № 1.
3. Cabbarov M. Təhsil sistemi milli dəyərlərə və peşəkar kompetensiyalara malik Azərbaycan vətəndaşı yetişdirməlidir. “Azərbaycan” qəzeti, 2013, 15 sentyabr.
4. Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri. Ümumi təhsildə inteqrasiya. Bakı: Mütərcim, 2014.


**А.Аскерова**

**Управление человеческими ресурсами в школе**

**Резюме**

**В статье говорится о целесообразных, рациональных методах управления человеческими ресурсами и их применении.**

**A.Asgarova**

**School: Management of human resources**

**Summary**

**The article is dedicated to the cost effective methods which are used in managing human resourses and their implementation ways.**



# PEDAQOJİ QİYMƏTİN PSİXOLOJİ MƏSƏLƏLƏRİ HAQQINDA

**Əbdül Əlizadə,**
*psixologiya elmləri doktoru, professor*

*Açar sözlər: pedaqoji qiymət, rəqəmli qiymət, sözlü qiymət.*
*Ключевые слова: педагогическая оценка, цифровая оценка, вербальная оценка.*
*Key words: pedagogical assessment, numeric mark, oral mark.*

Qiymətləndirmə qrup həyatının ümdə psixoloji problemlərindən biridir. İnsanların bir-birinə verdikləri emosional və ya intellektual, əxlaqi və ya estetik qiymətlər nəinki fəaliyyət və ünsiyyət prosesində şəxsiyyətin, həm də şəxsiyyətlərarası münasibətlərin formalaşdırılmasında önəmli rol oynayır.

Pedaqoji qiymət, qiymətin özünəməxsus növü kimi meydana çıxır. Hələ 30-cu illərin əvvəllərində aparılmış fundamental tədqiqatlar qiymətin tərbiyə vasitəsi kimi böyük əhəmiyyətə malik olduğunu göstərirdi. Müəyyən edilmişdir ki, qiymət təkcə şagirdin əqli işinə deyil, həm də onun yaşadığı müvəffəqiyyət və uğursuzluq hisləri vasitəsilə affektiv-iradə sahəsinə, iddia səviyyəsinin, niyyətlərinin və münasibətlərinin formalaşmasına köklü təsir göstərir.

İki şagird təsəvvür edək. Müəllim yeni dərsi ikisindən də soruşmuşdur, ikisi də "4" almışdır. Lakin biri gülə-gülə gedib öz partasında oturur. O biri isə...həyəcanlanır. Sifəti gülmür. Gündəliyi əsəbi halda partanın üstünə atır.

Hər bir şagird aldığı qiymətə özünəməxsus məna verir. Bu təkcə şagirdin mənlik şüurunun və ya iddia səviyyəsinin xüsusiyyətlərinə bağlı deyildir. Qiymətləndirmə məqamında şagird üçün müəllimin münasibəti, onun baxışı, vokal minikası, sözlərinin emosional konteksti və s. bəlkə də qiymətdən daha çox əhəmiyyət kəsb edir.

Qiymətləndirmənin sinif şagirdləri və valideynlərin reaksiyaları ilə bağlı olan köklü sosial-psixoloji effektləri vardır. İlk baxışda elə təəssürat yaranır ki, bu özünəməxsus proses iki nəfərin – müəllim və şagirdin münasibəti sahəsini əhatə edir. Əslində isə onun təsir dairəsi daha genişdir: müəllim və qiymətləndirilən şagirdlə bahəm, həm də sinif kollektivinin bütün üzvləri qiymətləndirmə situasiyasının iştirakçılarıdır. Müəllim və şagirdlərin bu situasiyada rolu aydındır: biri qiymət alır, o biri qiymətləndirir. Bəs, bu prosesdə "sinif uşaqlarının" rolu nədən ibarətdir? Onlar sinifdə, şübhəsiz ki, adi tamaşaçı deyildirlər. Qiymətləndirmə situasiyalarında öz qiymət ölçüləri ilə bilavasitə iştirak edirlər. Bu qiymətlər çox vaxt emosional qiymət kimi özünü göstərir və onların həm müəllimə, həm də qiymətləndirilən şagirdə - özlərinin sinif yoldaşlarına münasibətlərini əks etdirir. "Uşaqlar" sinifdə qiymətləndirmə situasiyasında müəllimi, ilk növbədə, daha çox insan kimi dəyərləndirirlər.

Ailənin də şagirdin qiymətlərinə reaksiyaları önəmlidir. Ailə söhbətlərində bu qiymətlər valideyn ölçüləri ilə müzakirə olunur. Və... çox vaxt sadəcə olaraq öz gözünə inanan – uşağın, necə deyərlər, səhərdən axşamacan evdə dərs oxuduğunu görən, lakin onun nə və necə oxuması ilə ma-

raqlanmayan valideynlər, təəssüf ki, çox vaxt bu məqamda hissiyyata qapılır, analıq və atalıq hissinin fəhmində müəllimi deyil, şagirdi müdafiə edirlər. Müəllimin qiymətlərində şəxsi-qərəzlik axtarırlar və hətta bunu əsaslandırmaq üçün "karlı", əslində isə təsadüfi faktlar da tapırlar. Şagirdin akademik qiymətləri axarında valideyn-övlad münasibətlərində tədricən əmələ gələn emosional çalarlar ailə-məktəb, valideyn-müəllim münasibətlərinə də öz təsirini göstərməyə başlayır...

Məktəb təcrübəsində qiymət tarixən motivasiya yaratmaq vasitəsi kimi əmələ gəlib. Uşağı sadəcə olaraq həvəsləndirmək, maraqlandırmaq, şirnikləndirmək istəmişlər. Onu danlayanda da, qorxudanda da bu amala söykənmişlər. Bu kökdə məktəb təcrübəsində SQ bərqərar olmuş və özünəməxsus yer tutmuşdu. Məktəbin inkişafının müəyyən mərhələsində RQ meydana çıxmış və tədricən az qala başlıca qiymətləndirmə, əslində isə özünəməxsus nəzarət vasitəsinə çevrilmişdi. RQ kəmiyyət göstəricilərinə əsaslanırdı, dərsdə SQ-yə nisbətən müəllimin hökmünü, ədasını daha aydın göstərirdi və özözünü SQ-ni bu və ya digər dərəcədə sıxışdırırdı. Müəllim sözlə qiymət verəndə məsləhətçiyə oxşayırdı, rəqəmlə qiymət verəndə - şagirdə, tutaq ki, "2" yazanda isə daha zabitəli görünürdü.

Şagird üçün mənasına görə pedaqoji qiymətin iki funksiyasını – məlumatverici (informasiyaverici) və nəzarətedici funksiyalarını ayırd etmək olar. Birinci halda şagird pedaqoji qiymət vasitəsilə özünün güclü və zəif tərəfləri haqqında məlumat əldə edir. İkinci halda isə pedaqoji qiymət nəzarət amili kimi özünü göstərir, tədris uğurları və uğursuzluqları üçün rəğbətləndirmə və cəzalandırma vasitəsi kimi meydana çıxır.

Pedaqoji qiymətin məlumatverici funksiyası SQ, nəzarətedici funksiyası RQ vasitəsilə həyata keçirilsə də, bunlar əslində qarşılıqlı əlaqədədir, eyni prosesin iki tərəfidir və vəhdətdə tətbiq olunmalıdır. Psixoloqlar bu funksiyaları müqayisəli təhlil etmişlər. Müəyyən edilmişdir ki, RQ birtərəfli tətbiq olunduqda istənilən effekti vermir. Bu yolla şagirddə dərsə "maraq" yarananda da onun kökü ürəkdə olmur, zahiri motivlərlə şərtlənir. Xarterin tədqiqatları bu baxımdan əlamətdardır. Müəyyən edilmişdir ki, məktəbdə rəqəmlə qiymətləndirmə təcrübəsi şagirdlərin dərsə daxili marağını, sözün əsl mənasında, nəinki artırmır, əksinə, azaldır. VI sinif şagirdlərinə müxtəlif çətinlikli məsələləri həll etmək təklif olunmuşdu. Onların yarısına demişdilər ki, bu oyundur, o biri uşaqlara isə demişdilər ki, bu tapşırıqdır, bunun üçün onlara qiymət (RQ) veriləcəkdir. Eksperimentin nəticələri çox ibrətamizdir: məsələləri yaxşı qiymət almaq üçün həll etməyə çalışan şagirdlər daha asan tapşırıqlar seçmişdilər.

Halbuki SQ şagirdlərdə daxili motivasiya yaratmağın təsirli vasitəsidir. RQ həmişə onunla qarşılıqlı əlaqədə tətbiq olunmalıdır. Müəllim şagirdin biliyini hesaba alarkən RQ-ni əsaslandırmırsa, psixoloji ölçülərlə izah etmirsə (SQ) pedaqoji qiymət öz tərbiyəvi əhəmiyyətini əslində itirir. Məktəb təcrübəsində də məhz bu zəmində köklü nöqsanlar meydana çıxır. Müəllimlərin iş təcrübəsinin təhlili göstərir ki, onlar SQ-nin tərbiyə imkanlarından çox vaxt səmərəli istifadə edə bilmirlər, hətta bir çox hallarda qiymətləndirmənin təsir dairəsini yerli-yersiz məhdudlaşdırır, şagirdin biliyini çox vaxt rəqəmlə qiymətləndirdiyi halda, onu əsaslandırmır, biliyin nə üçün məhz " 3" və ya "4" balla qiymətləndirildiyini izah etmirlər. Təkrar edirik: bu, necə deyərlər, birtərəfli qiymətləndirmə üsulu məktəb təcrübəsində özünü göstərən ciddi nöqsanlardan biridir.

RQ və SQ özlərinin funksiyalarına

görə bir-birindən köklü surətdə fərqlənirlər. RQ şagirdin tədris fəaliyyətinin nəticəsini ancaq kəmiyyət baxımından təsvir etdiyi halda, SQ onu məzmunca, keyfiyyət ölçüləri ilə səciyyələndirir.

Psixologiyada SQ-nin iki tipini – 1) müvəffəqiyyətin bilavasitə hesaba alınmasında və 2) müvəffəqiyyətin hesaba alınması gedişində şagirdlərə verilən sözlü qiymətləri fərqləndirirlər. 2-ci tip qiymətləri partsial (latınca partialus, pars (partis) – "hissə", "ayrıca", "xüsusi" deməkdir) qiymətlər kimi səciyyələndirirlər.

I tip qiymətlər. Müəllim müvəffəqiyyəti bilavasitə hesaba alanda onu təkcə rəqəmlə "qiymətləndirmir", şagirdin biliyinə verdiyi "qiyməti" (balı) əsaslandırır. Şagirdin nəyi yaxşı izah etdiyini, nəyi səhv saldığını izah edir. Şagirdi daha yaxşı səy göstərməyə və ya yol verdiyi nöqsanları aradan qaldırmağa yönəldir. Psixoloji tədqiqatlar əsaslı surətdə göstərir ki, müvəffəqiyyəti bilavasitə hesaba alanda müəllimin pedaqoji qiymətdən psixoloji cəhətdən səmərəli istifadə etməsi tərbiyə baxımından böyük əhəmiyyətə malikdir.

II tip qiymətlər. Partsial qiymətlərin müxtəlif növlərini fərqləndirirlər. Onlardan bəzilərini misallarla nəzərdən keçirək.

Müəllim şagirdi yazı taxtasına çağırır. O, yazı taxtasına yaxınlaşıb məsələnin şərtlərini yazır və həll etməyə başlayır. Sinif yoldaşları onu diqqətlə izləyirlər. Müəllimin də gözü ondadır. Şagird haradasa çaşır, yazdıqlarını pozur, yenidən yazır, ancaq cavab alınmır. O, sinfə göz gəzdirir. Sinif yoldaşları da məsələnin həllini bilmədikləri üçün ona kömək edə bilmirlər. Şagird müəllimə baxır. O, sinif jurnalına göz gəzdirib deyir: "Yaxşı, otur, qoy Leyla gəlsin...".

Müəllim bu situasiyada şagirdə bilavasitə qiymət vermir. Ancaq situasiyanın özü – məsələnin həll olunmaması şagird üçün qiymətləndirici əhəmiyyət kəsb edir. Lakin bu situasiyanın psixoloji effekti aydındır: müəllim şagirdi istər-istəməz depressiya şəraitinə salır, onun özünə korkoranə qiymət verməyə məcbur edir. Bu baxımdan şagirdin bilavasitə qiymətləndirilməməsi qiymətin ən pis növü sayılır. Psixoloji tədqiqatlar göstərir ki, şagird nəyi isə izah etməkdə və həll etməkdə çətinlik çəkirsə, bu şəraitdə qiymətin əhəmiyyəti daha da artır: müəllim bu yolla şagirdin diqqətini başlıca məsələlərə cəlb edir.

Bir sıra hallarda partsial qiymət vasitəli xarakter kəsb edir.

Müəllim şagirdi yazı taxtasına çağırır və ona suallar verir. Şagird sualları aydınlaşdırır. Müəllim ona qulaq asır, ancaq cavabın düz olub-olmaması barədə öz rəyini bildirmir. O, cavab verən şagirdə heç nə demədən başqa bir şagirdi yazı taxtasına çağırır. O, suallara cavab verdikcə müəllim başı ilə təsdiq edir: "Bax belə"... Şagird cavab verib qurtardıqda isə deyir: "Bu başqa məsələ". O, ikinci şagirdə müraciət edərək əlavə edir: "Otur". Bundan sonra birinci şagirdə baxır: "Sən də otur".

Vasitəli qiymətləndirmə situasiyasında şagird asanlıqla gülüş obyektinə çevrilir, bu ovqatla sinifdə istər-istəməz yadlaşır, onun nəinki müəllimə münasibəti dəyişir, həm də sinif yoldaşları ilə, ilk növbədə, keçmiş rəqibi ilə münasibətləri pisləşir.

Müəyyən edilmişdir ki, vasitəli qiymətləndirmə situasiyasına məktəbdə ən çox təlimdə geri qalan, yaxşı oxumayan şagirdlər düşürlər. Onlarda özünəməxsus inamsızlıq hissi özünü göstərir: nəinki sualı başa düşmürlər, həm də cavab verməkdən çəkinirlər, sual təkrar olunsa da, inadla susurlar, müəllim ikinci şagirdi tərifləyəndə kinli baxışlarla onlara – həm müəllimə, həm də ikinci şagirdə baxırlar. Bu şəraitdə qiymətləndirmə özünün tərbiyəvi əhəmiyyətini itirir.

Qeyri-müəyyən qiymət də psixoloji

cəhətdən səmərəli deyildir. Şagird nəyi isə izah etməkdə çətinlik çəkir. Müəllim isə sinfə göz gəzdirə-gəzdirə deyir: “Bəsdir, keç otur... Qoy Məmməd gəlsin”. Şagird müəllimin sözlərini (“Bəsdir, keç otur”) qiymət kimi qəbul edir, lakin bu sözlər qeyri-müəyyən xarakter daşıdığından onların mənasını özü üçün aydınlaşdıra bilmir. Bu zaman müəllimin səsi, sözü necə vurğulaması, əl-qol hərəkətləri və s. şagird üçün daha çox şəxsi məna kəsb etsə də, qiymət onun üçün qeyri-müəyyən səslənir. Şagirdin nəyi bilməsi, nəyi isə bilməməsi dəqiq aydınlaşdırılmır.

Müəllimin sorğu zamanı şagirdlə razılaşması və ya razılaşmaması, onu təqdir etməsi və ya etməməsi, bir çox hallarda tərifləməsi və ya irad tutması, öyüd-nəsihət verməsi və ya istehza ilə ələ salması, danlaması və ya hədələməsi - bunlardan hər biri partsial qiymət kimi təlim motivlərinin formalaşmasında özünəməxsus rol oynayır.

Pedaqoji psixologiyada partsial qiymətlərin nəzərdən keçirdiyimiz formaları müşahidə materialları əsasında təsvir olunmuşdur.

Təhsilin humanistləşdirilməsi şəraitində onlardan bir çoxuna (istehza ilə ələ salma, danlama, hədələmə və s.) yeni baxımdan yanaşmaq lazımdır. Təcrübə göstərir ki, öyüd-nəsihətdən də sui-istifadə etmək olmaz. Tərifin isə həddi-hüdudu, həm də psixoloji əsası olmalıdır.

Rəğbətləndirmənin psixoloji effektlərini araşdırmaq məqsədilə aparılmış tədqiqatlar bu sahədə bərqərar olmuş ənənəvi təsəvvürləri eksperimental faktlar əsasında dəqiqləşdirmək, yeni baxımda qiymətləndirmək imkanı verir. Amerika psixoloqu Edvard Detsinin eksperimentləri bu baxımdan diqqəti cəlb edir. Eksperimentlər təxminən aşağıdakı ümumi sxem əsasında təşkil olunmuşdu.

Şagirdlərə istədikləri işlə məşğul olmağı təklif edirlər. Onlardan kimsə, tutaq ki, rəsm çəkməyə, hansısa sevdiyi musiqi alətini çalmağa, kimsə xoşladığı fotoşəkil çəkməyə başlayır. Şagirdləri iki qrupa – eksperimental və kontrol qruplara ayırırlar. Eksperimental qrupda şagirdlərə sevdiyi işlə məşğul olandan (tutaq ki, rəsmi çəkib qurtarandan) sonra pul verirdilər. Kontrol qrupda isə şagirdlərdən hər biri sevdiyi işlə məşğul olurdu, lakin onları rəğbətləndirmirdilər. Eksperimentin nəticəsi gözlənilməz oldu: eksperimental qrupda şagirdlər rəğbətləndirildikdən sonra onların sevdikləri məşğələyə maraqları tədricən azalmağa başladı. Halbuki kontrol qrupda şagirdlər uzun müddət sevdikləri işlə məşğul olurdular.

Müəyyən edildi ki, rəğbətləndirilmə vasitələri heç də həmişə eyni effekti vermir. Tərbiyə işində bu kökdə nə qədər nöqsanlara yol verilir. Şagirdi tərifli sözlərlə daha yaxşı oxumaq üçün ruhlandırmaq istəyən müəllim öz məqsədinə nail ola bilmirsə, qoy uğursuzluqlarının köklərini Edvard Detsinin eksperimentlərinin qeyri-adi nəticələrilə araşdırsın... Müəllim şagirdi tərifləyərkən, ilk növbədə, onun tapşırığa münasibətini nəzərə almalıdır. Əgər şagird, tapşırığı adi tapşırıq kimi qəbul edirsə, müəllimin tərifli sözləri onun təlim motivlərini öz-özünə zəiflədir. Şagird kifayət qədər çətin saydığı tapşırığı yerinə yetirdikdə, müəllimin tərifini öz imkan və qabiliyyətlərinə verilən yüksək qiymət kimi qavrayır.

Bir çox hallarda müəllimlər şagirdi tərifləyəndə onun uğurlarını hər hansı bir başqa şagirdin uğurları ilə müqayisə edirlər. Psixoloji tədqiqatlar bu priyomun səmərəli olmadığını göstərir. Şagirdin uğurlarını hər hansı başqa şagirdin uğurları ilə deyil, onun özünün əvvəlki nəticələri ilə müqayisə etmək lazımdır. Bu priyom xüsusilə zəif şagirdlərlə iş zamanı daha yaxşı nəticə verir. Zəif şagirdin bugünkü yaxşı cavabını dünənki pis cavabı ilə müqayisə edib tərif-

ləyəndə, onda təlim motivlərinin inkişafı üçün özgün əhəmiyyətə malik olan müvəffəqiyyət hissinin əmələ gəlməsinə əlverişli şərait yaranır.

Bir cəhəti də qeyd etmək lazımdır. Bəzi müəllimlər qiymətləndirmə zamanı şagirdlərin təlim uğurlarını onların qabiliyyətləri ilə əlaqələndirirlər, bəzi müəllimlər isə daha çox onların dərsə hazırlaşarkən səy göstərib-göstərməməsinə diqqət yetirirlər. Psixoloji tədqiqatlar göstərir ki, təlim motivlərinin inkişafı baxımından ikinci yol daha səmərəlidir. Müəllim pedaqoji qiymət vasitəsilə şagirdin səyini səfərbər etməli, onu daha da aktivləşdirməli, özünü təlim fəaliyyətinin subyekti kimi dərk etməsi üçün əlverişli şərait yaratmalıdır.

Bəzi psixoloqların fikrincə, RQ mahiyyətcə uşaq təbiətinə yaddır. Çox ehtimal ki, gələcək məktəbdə, humanizmin, sözün əsl mənasında, təntənəsi və zəfər çalması şəraitində RQ öz əhəmiyyətini tədricən itirəcək, SQ isə xüsusi əhəmiyyət kəsb edecək və ölçülüb-biçilmiş psixoloji konsepsiya əsasında daha geniş tətbiq olunacaq.

Pedaqoji qiymətin obyektivliyi məsələsi həmişə aktual olmuşdur, lakin müasir təlim nəzəriyyəsində bu məsələ diqqəti daha çox cəlb edir.

Pedaqogika və fənlərin tədrisi metodikalarında qiymət meyarlarına nə qədər əhəmiyyət verilsə də, subyektiv amillər qiymətləndirmə prosesində önəmli rol oynayır. Psixoloqlar eksperiment aparmışlar: eyni şagirdlərin bilik, bacarıq və vərdişlərini həm onlara dərs deyən müəllim, həm də başqa bir müəllim qiymətləndirmişdir. Müəyyən edilmişdir ki, müəllim öz şagirdlərinin bilik, bacarıq və vərdişlərini təxminən 0,5 bal dairəsində yüksək qiymətləndirir. Bu sahədə bir meyil də özünü göstərir. Müəllimlər sevdikləri şagirdlərin qiymətlərini bir qayda olaraq şişirdir, xoşlamadıqları şagirdlərin qiymətlərini isə aşağı salırlar. Müəllimlər qiymətdən təzyiq vasitəsi kimi istifadə edəndə, psixoloji cəhətdən daha çox səhvə yol verirlər. Sinifdə isə şagirdlərin çoxu bunu uşaq fəhmilə sezir və müəllimin ikili qiymət meyarları ilə çox vaxt razılaşmırlar.

Müvəffəqiyyətin hesaba alınması sahəsində özünü göstərən subyektivlik halları psixologiyada çoxdan bəllidir. Bu sahədəki səhvlərin dərk edilməsi zəminində də nailiyyət testləri əmələ gəlmişdir. Nailiyyət testləri özünəməxsus psixodiaqnostik metodika kimi mənimsəmə səviyyəsinin obyektiv ölçülərlə müəyyənləşdirilməsini nəzərdə tutur. Hal-hazırda bu məqsədlə EHM-in imkanlarından da istifadə olunur. Təəssüflə də olsa, yenə də qeyd etmək lazımdır ki, respublikamızın ümumtəhsil məktəblərində hələ bu metodikalardan, demək olar ki, istifadə edilmir. Halbuki rübün və ya tədris ilinin axırında mənimsəmə səviyyəsinin nailiyyət testləri və ya EHM-lər vasitəsilə müəyyənləşdirilməsi son dərəcə faydalı olardı. Bir nömrəli məsələni də açıqlayaq. Şagirdin dərsdə aldığı qiymətlər, görəsən, onun qabiliyyətlərini əks etdirirmi? Müəllimlər şagirdlərin bilik, bacarıq və vərdişlərini qiymətləndirəndə bu cəhəti nəzərə alırlarmı?

Şagird qiymətlərinin görünməyən tərəfləri var. Psixoloqlar ilk baxışda qeyri-adi görünən faktlara diqqəti cəlb etmişlər.

Eyni sinifdə oxuyan, eyni dərsdə "5" qiymət alan və müəllimin eyni sözlərlə təriflədiyi iki şagirdin "yaradıcılıq sirləri" ilə tanış olanda məlum olur ki, onlardan biri dərsliyi, tutaq ki, 4 dəfə oxuyub və "5" alıb, halbuki ikinci şagird dərsliyi əslində oxumayıb. Sadəcə olaraq ötəri gözdən keçirib, ancaq müəllim yeni dərsi danışanda ona diqqətlə qulaq asıb, müəllim ondan dərs soruşanda isə ətraflı cavab verib və "5" alıb.

Müəllim eyni dərsdə eyni ölçülərlə "5" yazıb, lakin bu qiymətlərdən hər birinin

qəribə "tərcümeyi-halı" var. Müəllim onların bu qiymətlərinin "tərcümeyi-halı" ilə maraqlananda sirli bir aləmə - qabiliyyət aləminə gəlib çıxır. Səhv etməmək, necə deyərlər, qaş düzəldən yerdə göz çıxarmamaq üçün bu aləmin xüsusiyyətlərini artıq güzəran ölçüləri ilə deyil, ancaq və ancaq psixoloji ölçülərlə araşdırmaq lazımdır.

Psixoloqlar bu məsələni sistemli şəkildə araşdırmağı məsləhət görürlər. Onlar dərsə yaxşı gəlməyən, bir yerdə oturmağa hövsələsi çatmayan, açıq-aşkar nitq çətinlikləri olan, aşağı gəlirli ailələrdə və ya valideyn nəzarətsizliyi şəraitində böyüyən, ancaq dərsdə kifayət qədər yüksək nəticələr göstərən şagirdlərə xüsusi diqqət yetirməyi, başqa sözlə, bilavasitə onların qabiliyyətləri ilə maraqlanmağı zəruri sayırlar...

Təhsilin humanitarlaşdırılması, dərsin infrastrukturu, şagirdin təlimdə geridə qalması, pedaqoji qiymətin effektləri - bunların hər biri öz-özlüyündə önəmli psixoloji-pedaqoji problemdir, lakin onların hamısı bu və ya digər dərəcədə köklü mətləblə - tələbat-motivasiya sahəsinin formalaşması ilə bağlıdır.

Rəvayətə görə, müəllim altı yaşlı Cəlaləddin Ruminin əlindən tutub aparırdı. Mühiddin bunu görəndə ayaq saxladı və heyrətlə onları seyr etməyə başladı. Adamlar ondan bu qeyri-adi heyrətin səbəbini soruşanda Mühiddin dedi: "Allahın möcüzəsinə bax ki, bir qətrə su böyük bir ümmanı arxasınca aparır".

Obrazların bənzərsiz məntiqinə diqqət edin: "bir qətrə su" – müəllim, "böyük bir ümman"ı – şagirdi arxasınca aparır. Müəllim qüdrəti də bunda, şagirdi, sözün məcazi mənasında, məharətlə öz arxasınca aparmasında idi və onu öz arxasınca aparanda müəllim məhz psixoloji ölçülərə söykənirdi. Müəllim yalnız psixoloji sərrastlıqla şagirdin cazibə qanununu kəşf edəndə, onun "Mən" konsepsiyasını – özü haqqında təsəvvürlərini (K.Rocers) formalaşdırıb təlimə şəxsi mənası olan özünəməxsus münasibət yaradanda, dərslə maraqlandırdıqda, ancaq və ancaq bu şəraitdə onu öz "arxasınca apara" bilər.

Müəllimin şagirdi "arxasınca aparması" Mühiddinin dövründə möcüzə sayılırdı, bu gün isə müəllimin önəmli psixoloji missiyalarından biri hesab olunur. Şagirdin tələbat-motivasiya sahəsini formalaşdırmaq, onun özünü aktuallaşdırması" (A.Maslou) üçün əlverişli şərait yaratmaq tədris fəaliyyətinin səmərəli olmasının rəhnidir.

**А.Ализаде**

**О психологических задачах педагогического оценивания**

**Резюме**

**В статье повествуется о педагогическом оценивании и его функциях. Отмечается, что оценка продолжает являться средством появления мотивации.**

**A.Alizadeh**

**Psychological issues of pedagogical assessment**

**Summary**

**İn the article is dedicated to pedagogical assessment and its functions. İt is noted that the assessment has historically emerged as a means of motivation.**

*3



# ŞƏXSİYYƏT VƏ ONUN FORMALAŞDIRILMASI: SOSİAL-PSİXOLOJİ MƏSƏLƏLƏR

**Ramiz Əliyev,**
***ADPU-nun kafedra müdiri,***
***psixologiya üzrə elmlər doktoru, professor***

***Açar sözlər:*** ***təhsil, dəyərlər, qloballaşma, davranış, inkişaf, motivasiya, həyatın mənası.***

***Ключевые слова:*** ***образование, ценности, глобализация, поведение, развитие, мотивация, смысл жизни.***

***Key words:*** ***education, care virtues, globalization, behavior, development, motivation, life meaning.***

Tarixən olduğu kimi, müasir dövrdə də şəxsiyyətin formalaşması onun bilik, bacarıq və qabiliyyətləri, şəxsi keyfiyyətləri, mədəni səviyyəsi cəmiyyət üçün ləyaqətli vətəndaş kimi inkişaf etdirilməsi ilə vəhdətdə götürülür. Tarixi proseslərin dinamikası müxtəlif sosial şərait yaradır, başqa sözlə, ictimai-iqtisadi və istehsal münasibətlərinin daim dəyişməsi də şəxsiyyətin formalaşmasına təsir edir.

Dünyada insan haqları, demokratiya və humanizmlə bağlı iki bir-birinə əks mövqe mövcuddur. Birinci mövqe ondan ibarətdir ki, azadlıq, insan haqları konkret mədəni-tarixi şəraitdən, inkişaf səviyyəsindən, milli xüsusiyyətlərdən asılı olaraq götürülməlidir. İkinci mövqeyə görə, insan haqları, azadlıq universaldır və bütün ölkələr, xalqlar üçün vahid qaydaya əsaslanmalıdır.

İqtisadi, siyasi dəyişiklik, eyni zamanda sosiomədəni dəyişikliyə səbəb olur. Bu isə müəyyən qədər çaşqınlıqla nəticələnir. Həyat insanın özünə və başqalarına münasibət baxımından şəffaflığını itirir, sanki həyat onlar üçün anlaşılmaz və tanınmaz olur. İnsanlar tədricən yeni model, dəyərlər sistemi yaratmağa, ona uyğunlaşmağa, özünüreallaşdırma və özünütəsdiqə başlayırlar.

Təcrübə göstərmişdir ki, insanın həyata identifikasiyasının itməsi onun xarici mühitin təsirinə adekvat cavab verə bilməməsinə səbəb olur. Belədə insan az qala öz “MƏN”ini itirir, özünü necə aparmaqda çətinlik çəkir. Hesab edir ki, həyat onun istək və tələblərinə cavab vermir, o, başqaları tərəfindən düzgün qiymətləndirilmir. İnsanlara elə gəlir ki, ətrafdakılar, hətta yaxın adamlar onu düzgün başa düşmür, dərk etmirlər. Nəticədə o özü üçün də yadlaşır. Belə psixoloji halət zamanı insanda inamsızlıq, ümidsizlik, həyəcanlanma, depressiya və psixoz güclənir.

O da faktdır ki, mühitə identifikasiya sosiallaşma prosesində baş verir və əsasən

iki səbəbdən: kəskin psixi dəyişiklik və sosial mühitin sürətli dəyişilməsi səbəbindən pozula bilər.

70 illik sovet rejimində insanın formalaşdırılması yalnız məktəbin vəzifəsi hesab olunurdu. Çünki dövlətin siyasətini, sovet adamı formalaşdırılmasını yalnız dövlət tərəfindən idarə olunan, vahid sistemi olan məktəb həyata keçirə bilərdi. Sonrakı dövrdə bu vəzifələrin bir qismi valideynlərin, ailənin üzərinə qoyuldu.

Düzdür, ailə təlim-tərbiyə prosesindən kənarda qala bilməz, bununla belə, hesab edirik ki, məktəb də daha məsuliyyətlə öz işinə yanaşmalıdır, xüsusilə tərbiyə sahəsində.

Beləliklə, istər cəmiyyətdə, istərsə də şəxsi həyatda köklü və sürətli dəyişikliklər baş verir. Avropa standartlarına uyğun bir sıra davranış formaları vardır ki, bunlar tədricən Azərbaycanda da öz dayaqlarını tapmaqdadır. Bu, əsasən, gənc azərbaycanlılara aiddir. Onların davranışında Qərb işgüzarlığına aid olan keyfiyyətlər təşəkkül tapmaqdadır. Onların dəyər və davranış formaları üçün praktik işgüzar stil, hərəkət və ünsiyyətində qəbul olunmuş normalara dəqiq əməl etmək, müasir texniki avadanlıqlardan bacarıqla istifadə etmək və s. xarakterikdir.

Qloballaşan dünyada, o cümlədən Azərbaycanda cəmiyyət həyatında köklü dəyişikliklərin getdiyi və getdikcə dərinləşən proseslərin baş verdiyi artıq heç kəsdə şübhə yeri qoymur. Son dərəcə sürətli dəyişikliklər, informasiyanın sürətli axını, sosial şəbəkələr, texnikanın inkişafı, beynəlxalq əlaqələrin güclənməsi, həyati qaydaların dəyişməsi insan psixikasına, qarşılıqlı münasibətlər sisteminə ciddi təsir göstərir. Azərbaycan üçün bu köklü dəyişikliklər, qloballaşma, dünyanın sürətli inkışafından geridə qalmamaq cəhdi və bu sahədə böyük uğurlar qazanılması, sosial, iqtisadi sahədə əldə olunan nailiyyətlər və eyni zamanda kəskin qütbləşmə, asoisial davranışın güclənməsi, nəsillər arasındakı anlaşılmazlıq, gender problemi və s. günün reallığıdır. Və bu vəziyyət şəxsiyyət probleminə, insan amilinə yenidən nəzər salmağa, yeni dövrün tələblərinə cavab verə bilən şəxsiyyətlər formalaşdırmağa sövq edir. Bütün bunlar isə təhsili cəmiyyət həyatının mərkəzinə qoyur.

Göründüyü kimi, mənəvi əxlaqi dəyərlərə sahib olan şəxsiyyətlərə ondan da çox ehtiyac yaranır. Bu heç də yenilik deyil ki, təlim və tərbiyə vəhdətdə olmalıdır. İndi yalnız insanın yaşadığı mühit deyil, insanın özü də dəyişib. İndi onun maraq dairəsi, tələbatları, mənəvi-əxlaqi dəyərlərə münasibəti dəyişib. İndi təhsil sistemində kəskin şəkildə özünü göstərən problemlər heç də təhsilin, biliyin səviyyəsinin aşağı düşməsi, mənəvi və əqli inkişaf sahəsində aşınmaların olması ilə məhdudlaşmır. Problem ondadır ki, çox vacib olan və cəmiyyətin mənəvi, intellektual dəyəri sayılan mədəni səviyyə aşağı düşür. Bütün bunlar isə şüarlarla yox, insanın özünüfəallaşdırmasını, özünütəsdiqini təmin edə bilən sistemin yaradılması ilə mümkündür. Yəni təhsil bütöv, tam sistemdir. Ailədən, uşaq bağçasından, məktəbdən, ali məktəblərə qəbuldan və kadr hazırlığından keçir. Təhsilin başlıca məqsədi insana bacarıqlarının, qabiliyyətlərinin imkan verdiyi səviyyədə həyatda öz yerini tutmasına kömək göstərməkdir.

Psixoloq və sosioloqların fikrincə alimlər ətraf mühiti o qədər dəyişdirmişdir ki, bu mühitdə yaşaya bilmək üçün indi insanlar özləri dəyişməyə məcbur olmuşlar.

Yeni təhsil sistemində başlıca vəzifələrdən biri də cəmiyyətin inkişafının mühüm komponenti olmaqla təhsilalanları real şəraitə hazırlamaqdır. Lakin bu gün klassik pedaqoqların paradiqmaları, ənənəvi təhsilin məzmun və formaları mövcud

tələblərə hələ tam uyğunlaşmamışdır. Vaxtilə elmi biliklərin sahələrə ayrılması, diferensiasiyası faydalı hesab olunurdusa, onlar yaradıcı təfəkkürə, kreativ düşüncəyə imkan verirdisə, indi bu forma müəyyən qədər səmərəliliyini itirib. Ümumi və xüsusi bilik və vərdişlər təhsilalanların nəinki məhsuldar fəaliyyətini, inkişafını təmin etməli, eyni zamanda onlara özünütəkmilləşdirməyi, yaxın və uzaq məqsədi müəyyənləşdirməyi, onun səmərəli həlli yollarını tapmağı öyrətməlidir.

Qeyd etmək lazımdır ki, müasir dövrdə qlobal böhran yalnız ekologiyanı, iqtisadiyyatı əhatə etməklə məhdudlaşmır, o həm də mənəvi-əxlaqi dəyərlərə ciddi təsir göstərir. Mahiyyətcə müasir sosium, demək olar ki, bütün parametrlər üzrə dəyişmişdir. İndi bizim elmimizin, təhsilimizin qarşısında duran vacib məsələlərdən biri də müasir insanın, onun düşüncə və həyat tərzinin dərk olunması ilə bağlıdır. Müasir insanlar yeni tip təfəkkürün, şüurun, özünüdərkin daşıyıcılarıdır. İndi insanlar öz hüquqlarını daha çox tələb etdikləri halda vəzifə və borclarını sanki unudurlar. İndi motivasiya-tələbat sferasında gənclərdə maddi təminat, əyləncə, sərbəstlik, ətraf mühitə, insanlara biganəlik artır.

Hazırda tam mənası ilə dərk olunmayan yeni tarixi şərait antropogen sivilizasiya, informasiya sivilizasiyası və s. adlandırılmasından asılı olmayaraq müəyyən mənada insanları oxşar tale ilə üzləşdirir. Başqa sözlə, indi dünyada insan həyatının bütün sahələrində ciddi transformasiya, dinamik sosiomədəni proseslər gedir. Nəticədə milli-mənəvi dəyərlərdə deformasiya baş verir. Digər xalqların, millətlərin Avropa dəyərlərinə uyğunlaşması üçün bütün vasitələrdən istifadə olunur. Hətta məşhur amerika sosioloqu S.F. Xantinqton "sivilizasiyaların toqquşmasından" bəhs edərkən bunun nəinki mümkün olmadığını, əksinə, ciddi fəsadlar törədə biləcəyini qeyd edir.

Diqqəti cəlb edən məsələlərdən biri də uşağın sosiallaşması və psixi sağlamlığı məsələsidir. Burada valideynlərin, böyüklərin münasibəti, uşağa qarşı sevgisi mühüm rol oynayır. Müasir dövrdə böyüklərin, valideynlərin uşağa qarşı diqqəti, xüsusən sevgisi azalıb. İndi atasız doğulan, küçəyə atılan, valideynlərini (xüsusən ataları) uzun müddət görə bilməyən uşaqların sayı artıb. Yeniyetmələrin aqressiyası, deviant davranışa meyilliliyi çoxalıb. Bunun səbəblərini yeniyetmələr özləri belə ifadə edirlər: "Evdə bir, məktəbdə başqa mühit, televiziyada isə tamamilə fərqli şeyləri görürük". Belə fərqli mühit, fərqli standartlar, təbii ki, özünütəsdiqə cəhd edən yeniyetməyə ciddi təsir göstərər və göstərir də. Bütün bunlar öz növbəsində tərbiyəyə təsir edir.

Hazırkı təhsil islahatlarında diqqət yetirilən məsələlər təlimə yönəlib. Unutmaq olmaz ki, təlim və tərbiyə vəhdətdədir. Birində uğur qazanıb, digərində uğursuzluğa düçar olmaq mümkün deyil. Təhsilin birinci vəzifəsi ləyaqətli şəxsiyyətlər formalaşdırmaqdır. Tərbiyəsində, mənəviyyatında naqislik olan şəxslər ləyaqətli vətəndaş ola bilməzlər. Təəssüf ki, indi təhsil sistemində sosiallaşma, tərbiyə, bir sözlə, tərbiyənin fəlsəfəsi məsələlərinə lazımınca diqqət yetirilmir. İctimai nəzarət, böyüklərin uşaqlar qarşısında məsuliyyət hissi azalıb. Hələ məktəbəqədər yaş dövründən başlayaraq uşaqlar 20 il əvvəlki yaşıdlarından fərqli olaraq ətraf aləmi fərqli şəkildə qavrayırlar. Onların məkan qavrayışı dəyişib. İnternet, televiziya güclü şəkildə onların həyatına daxil olub. İnformasiya axını, məkan və zamanın dəyişməsi uşaqlarda stress yaradır.

Psixoloji tədqiqatlar göstərir ki, məktəbəqədər yaş dövründə psixi inkişafın, motivasiya-tələbat sferasının əsasını ünsiyyət təşkil edir. Burada valideynlər (xüsusən ana), böyük bacı və qardaşlar mühüm rol oy-

nayır. Ailədə uşaqların sayı kəskin şəkildə azalıb. Valideyn-övlad münasibətlərində ciddi dəyişiklik baş verib. İlk növbədə diqqəti cəlb edən odur ki, sanki valideynlərin uşaqlara qarşı diqqət və nəvazişi, ünsiyyət saxlamaları azalıb. Bir çox hallarda valideynlər özləri internetə, televiziyaya daha çox aludəçilik göstərirlər, nəinki uşağa. İndi həyətlərdə yaşıdların oynadığı, əyləndiyi, ünsiyyətdə olduğu vəziyyətlərə az rast gəlinir.

İndi qəbul edilməsi mümkün olmayan bir tendensiya başlanıb. Dünyanın əksər psixoloqlarının qəbul etdiyi bir həqiqət var məktəbəqədər yaş dövründə uşağın aparıcı fəaliyyət forması oyundur. Oyun psixi və fiziki inkişafın əsasını təmin edir. Bəs nə baş verir? Məktəbəqədər təhsil müəssisələri sanki bir-biri ilə bəhsə girərək, intellektdən, bir neçə dil öyrətməkdən, musiqidən və s. danışmaqla dünya standartlarından bəhs edirlər. Tədris proqramlarında yalnız təlim məsələləri öz əksini tapır.

Vəziyyət yeniyetməlik yaş dövrü ilə bağlı bir qədər də mürəkkəbdir. Bu yaş dövründə sosiallaşma, ünsiyyətə girmək tələbatı daha da aktuallaşır. Problem ondadır ki, yeniyetmələrin bu tələbatını ödəyə biləcək strukturlar, demək olar ki, yox vəziyyətindədir. Beləcə qeyri-formal qruplar yaranır və ya canlı ünsiyyət internetlə əvəz olunur.

Valideynlərin məktəbə münasibətində kəskin dəyişiklik açıq-aydın hiss olunur. Heç kəsə sirr deyil ki, pedaqoji ali təhsil müəssisələrinə qəbul olanların böyük əksəriyyəti heç də öz arzularına uyğun olaraq bu sahəyə gəlmirlər. Onların çoxu ya daha “nüfuzlu sahəyə” düşə bilməyənlər, yaxud da tam orta məktəbi zəif oxuyanlardır. Tələbələrin bir qismi təhsili başa vurduqdan sonra başqa sahədə işləmək arzusunda olduqlarını bildirirlər. Çox az qisim tələbə gələcəkdə müəllim olmaq istəyini qeyd edir. Hələ vaxtilə Bismark deyirdi: “Müharibədə generallar yox, məktəb müəllimləri qələbəni təmin edir”. Bu, cəmiyyət həyatında, dövlətin həyatında müəllimlərin necə mühüm rol oynadığını bir daha göstərir.

Məktəblilərin psixi inkişafına, təfəkkür tərzinə təsir edən amillərdən biri də kompyuterdir. Amerika psixoloqu S.C.Xarrisin maraqlı bir deyimi var: “Qorxulu orası deyil ki, vaxt gələcək kompyuter insan kimi fikirləşəcək. Qorxulu olan odur ki, vaxt gələcək insanlar kompyuter kimi düşünəcək” .

Pedaqoq və psixoloqların qarşısında duran mühüm vəzifələrdən biri də televiziyanın, kompyuterin insanlara, xüsusən məktəblilərin şüuruna, davranışına təsirini öyrənməkdən ibarətdir. Hələlik məlum olan odur ki, bunların pozitiv təsiri qədər də neqativ təsirləri vardır. İnternet və televiziyanın təsiri ilə uşaq, yeniyetmə və gənclər yalnız real aləmdən uzaq düşmürlər, həm də onlarda sosial normalara biganəlik, aqressivlik, deviant davranış özünü göstərir. İnternet asılılığı çoxsaylı saytlardan istifadəyə səbəb olur və bu saytların heç də hamısı xeyirxahlıq məqsədi ilə yaradılmayıb. Onların arasında zərərli olanlar da var. Bunların nəticəsi olaraq şəxsiyyətin formalaşmasında yeni istiqamətlər təzahür edir. Nəticədə yeniyetmə və gənclərdə özünümüdafiə kompleksi yaranır.

İndi şagirdlərin daha çox intellektual inkişafına, daha çox bilik əldə etmələrinə, bir sözlə, onların beyninin biliklərlə doldurulmasına çalışılır. Bunu valideynlər də istəyir. Təbii, bilik qazanılması, onun bacarığa çevrilməsi vacibdir, lakin bu biliklər reallıqda istifadə olunurmu? İndi təhsillə mədəni səviyyə arasında bağlılıq az qala itir.

Əgər XIX–XX əsrlərdə təhsilli adam həm də geniş dünyagörüşü, mədəni səviyyəsi olan şəxs idisə, indi bunu söyləmək çətindir. Onlar cəmiyyətin digər üzvləri üçün nümunə olmaq funksiyasını itirməkdədirlər.

Məlumdur ki, təhsil sisteminin strukturunu, məzmununu, forma və metodlarını dəyişdirmək son dərəcə mürəkkəb bir prosesdir. Veriləcək biliyin həcmi, onların mənimsədilməsi yolları və s. aktual olaraq qalır.

Cəmiyyət bütöv bir orqanizmdir. Əgər insan bədənində üzvlərdən biri sıradan çıxırsa, bədən məhv olur. İnsan acdırsa, onun yalnız mədəsi yox, həm də başı ağrıyır, bədən süstləşir. Yəni problemlər kompleks həll olunmalıdır. Yalnız təhsil sistemində ayrılıqda götürülmüş halda uğur qazanmaq mümkün deyil.

İndi milli-mənəvi, əxlaqi dəyərlər başlıca məsələ olmalıdır. Təhsil özü də mədəni-tarixi əsaslara söykənməlidir. Bu, heç də yaşlı nəslin sosiomədəni təcrübəsinin, dünyagörüşünün mexaniki şəkildə gənc nəslə ötürülməsi mənasında başa düşülməməlidir. Bunlarla yanaşı, dövrün tələblərinə uyğun fəal, çevik, yaradıcı təfəkkürə malik şəxsiyyətlər formalaşdırılmalıdır. Bu isə fasiləsiz təhsil, özünütəhsil, özünüreallaşdırma, özünütəsdiq sayəsində mümkündür.

Cəmiyyət həyatının reallıqları və insana verilən yeni tələblər, başqa sözlə, yeni insanın formalaşdırılması təhsil sistemində də yeni strategiyanın qurulmasını tələb edir. Təhsil elə qurulmalıdır ki, şəxsiyyətin sosiallaşmasını təmin edə bilsin. Bunun bir yolu da şagirdləri yalnız sinif otaqlarında deyil, ondan kənarda kollektivə, kollektiv tərbiyəyə, kollektiv vasitəsilə tərbiyəyə alışdırmaqdır.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 24 oktyabr 2013-cü il tarixli sərəncamı ilə təsdiq edilən "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda göstərilir ki, strateji istiqamətlərdən biri də "təhsil sahəsində insan resurslarının müasirləşdirilməsini nəzərdə tutur". Göstərilir ki, təhsil prosesində əldə olunan bilik və bacarıqlar, həmçinin etik-əxlaqi norma və dəyərlər hər bir təhsilalanın cəmiyyətin layiqli üzvü olması üçün lazımi şərait yaradır.

Göründüyü kimi, strategiyada başlıca hədəf insandır, onun inkişafıdır və nəticədə bütövlükdə cəmiyyətin mədəni səviyyəsinin yüksəldilməsidir. Bunların həyata keçirilməsi isə elm və təhsilin vəhdətdə fəaliyyətindən asılıdır.

İndi təhsil sferasında tez-tez işlənən fikirlərdən biri də "hafizə məktəbindən" "təfəkkür məktəbinə" keçilməsi ilə bağlıdır, biliyin bacarığa çevrilməsi fikridir. Reallıqda isə əksinədir. Təhsilin bütün pillələrində testləşdirmə ön plana keçib. Şagird və tələbələr öz fikirlərini yazılı şəkildə ifadə etməkdə çətinlik çəkirlər. İlbəil aqressiya, narkomaniya, deviant davranış, stress, psixoz, nevroz kimi pozuntuların faizi artır. Bəs, bunların böyüyən nəslin şəxsiyyət kimi formalaşdırılmasına dəxli yoxdur?!

Yaxşı olar ki, filosoflar, tarixçilər, sosioloqlar, psixoloqlar, pedaqoqlar və fizioloqlardan ibarət işçi qrupu yaradılsın. Uşaq, yeniyetmə və gənci hissələrə ayırıb hər bir elm sahəsinin özünə aid olanı öyrənməsi səmərəsiz yoldur. Çünki yeniyetmə də, gənc də, uşaq da vahid orqanizmdir və onlar bu elmlərin hamısının birgə gəldiyi nəticələrə əsaslanaraq öyrənilməlidir. Söhbət yalnız ictimai-tarixi prosesin bugünkü vəziyyətindən yox, həm də sonrakı inkişaf istiqamətlərini proqnozlaşdırmaqdan gedir. Proqnozlaşdırma cəmiyyətin və insanın inkişaf tendensiyalarına əsaslanan nəzəriyyə və metodologiyanın işlənib hazırlanmasına əsaslanmalıdır.

İndiki uşaq və gənclər 20 il əvvəlki həmyaşıdlarından xeyli fərqlənirlər. Təhsil də, elm də yeniyetmə və gənclərin ətraf mühiti, özlərini, başqalarını necə qavrayıb dərk etdiklərini nəzərə almalıdır. Qədim bir ingilis məsəli var: "Atı zorla çaya apara

bilərsən, lakin onu su içməyə məcbur edə bilməzsən".

Aydındır ki, çoxplanlı, mürəkkəb bir fəaliyyət sahəsini birdən-birə, həm də asanlıqla həyata keçirmək mümkün deyil. Amma düzgün istiqamət, tədricən, sistemli şəkildə görülən işlər öz müsbət nəticəsini verməlidir. Təhsilin, psixoloji-pedaqoji elmlərin qarşısında qoyulan məqsəd aydındır. Biz kreativ təfəkkürə, yaradıcı təxəyyülə, milli-mənəvi dəyərlərə, yüksək mədəniyyətə sahib olan ləyaqətli vətəndaşlar formalaşdırmaq istəyirik.

*Rəyçi: prof. F.Rüstəmov*

## İstifadə edilmiş ədəbiyyat


**1. "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası". // Azərbaycan məktəbi, 2013, №5.**

**2. "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı". //Azərbaycan məktəbi, 2015, № 1.**

**3. Rüstəmov F. "Psixoloji xidmətin təşkili məsələləri" kitabı haqqında. Bakı: ADPU-nun nəşri, I buraxılış, 1997, səh. 167-170.**

**4. Əliyev R. Şəxsiyyət və onun formalaşmasının əsasları. Bakı: Araz, 2000.**

**5. Əlizadə Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı: Ozan, 1998.**

**6. Гасанова Л. О некоторых актуальных вопросах современного образования. // Azərbaycan məktəbi, 2013, № 1.**

**7. Гаджиев К. Геополитика: история и современное состояние дисциплины. // Полис, 1996, №2.**

**8. Геллнер Э. Нации и национализм. М.: Прогресс, 1991.**

**9. Ионин Л. Социология культуры: путь в новое тысячелетие. М.: Логос, 2000.**

**10. Хантингтон С. Столкновение цивилизации // Полис, 1994, №1.**



**Р.Алиев**


### Личность и ее формирование: социально-психологические задачи


**Резюме**

**В статье автор дает характеристику состояния детей и подростков в современном азербайджанском обществе и в этом свете ставит проблемы организации оброзвания как важнейшего компонента развития общества. Показана исчерпанность классической педагогической парадигмы, что проявляется в неэффективности многих традиционных форм образования. Обсуждаются проблемы отношения общества к детству, влияния Интернета на отношение школьников к учебе.**



**R.Aliyev**


### Personality and its formation socio–psychological issues


**Summary**

**In the article the author characterizes children and teenagers in the existing society and emphasizes organizing of educational problems as an important factor. It is noted that classical pedagogical paradigm is exhausted which is noticed in irrationality of forms and content of traditional education. The attitude of society to children and the impact of internet on the children's education are also discussed here.**



***Pedaqogika***

# ÜMUMİ ORTA TƏHSİL SƏRİŞTƏLİLİK KONTEKSTİNDƏ

**Abdulla Mehrabov,**
***Rusiya Dövlət Təhsil Akademiyasının xarici üzvü, professor, əməkdar müəllim***

***Açar sözlər:* *məktəb təlimi, səriştəli yanaşma, idraki (dərk etmə) səriştəlilik.***
***Ключевые слова:* *школьное образование, компетентностный подход, познавательная компетентность.***
***Key words:* *school education, the competence approach, cognitive competence.***

Müasir dünyada sosial-iqtisadi şəraitin dəyişməsi, elmi biliklərin və texnologiyaların yüksək templə inkişafı peşə təhsili ilə bərabər, həm də orta məktəb təliminin kifayətedici səviyyədə dəyişməsini və modernləşdirilməsini tələb edir. Ona görə də orta məktəb məzunlarına olan münasibət dəyişdirilmiş, onların sürətlə inkişaf etmək qabiliyyətinə, davamlı fundamental biliklərə, müasir texnologiyalara, elmin müxtəlif sahələrinə bələd olma bacarıqlarına, əsaslandırılmış qərarların verilməsinə, özünütəhsilə və özünütəkmilləşdirməyə həmişə hazır olmalarına dair yeni tələblər irəli sürülmüşdür. Hazırkı mərhələdə yeni təhsil paradiqmalarının qurulmasında aktual istiqamətlərdən ən başlıcası səriştəli yanaşma hesab edildiyindən, ümumi orta təhsil sisteminin iqtisadi və ictimai inkişafının əsası kimi, məhz belə yanaşmanın tətbiqi öz aktuallığı ilə seçilir, onun geniş təbliğinin həyata keçirilməsi zamanın tələbi kimi dəyərləndirilir.

Pedaqoji ədəbiyyatın təhlili göstərir ki, son illərə qədər səriştəli yanaşma, əsasən, peşə təhsili sferasında geniş tətbiq edilməyə başlanılmışdır. Səriştəli yanaşmaya həsr olunmuş tədqiqatların təhlili bu yanaşmanın aktual bir problem kimi formalaşmasının və tətbiqinin, əsasən, aşağıdakı zərurətlə bağlı olduğunu müəyyən etməyə imkan vermişdir:

- peşə təhsilində yeni tip təlim nəticələrinin, peşəkar bilik, bacarıq və vərdişlərin formalaşdırılması ilə yanaşı, səriştəli yanaşmanın öz aktuallığını getdikcə daha ciddi formada aktivləşdirməsi;
- tədris prosesi ilə peşəkar fəaliyyət arasındakı ziddiyyətlərin zəiflədilməsi və aradan qaldırılması, eyni zamanda peşəkar təhsil sisteminin nümayəndələri ilə işəgötürənlər və məzunlar arasında işgüzar əlaqələrin yaradılması;
- peşəkar mütəxəssis hazırlığında, tələblər və imkanlar arasındakı münasibətlərin razılaşdırılmasının təmin edilməsi.

Son illərdə peşə təhsil sisteminin inkişafı və nəticələrin transformasiyası qanunauyğun olaraq məktəb təlimində dəyişikliklərin aparılması zərurətini yaratdı. Heç də təsadüfi deyildir ki, XX əsrin sonu XXI əsrin əvvəllərində Azərbaycanda ümumtəhsilin inkişafı ilə bağlı dövlət səviy-

yəsində bir sıra yeni sənədlər qəbul edilməyə başlanıldı. Bu sənədlərdə təhsil sistemində səriştəli yanaşmanın reallaşdırılması, açar kompetensiya anlayışının məzmununun müəyyənləşdirilməsi, açar kompetensiyaların məzmununa uyğun ümumtədris bacarıqların və vərdişlərin formalaşdırılması imkanlarının araşdırılması və alınmış nəticələrin tədris-təlim prosesinə gətirilməsi öz əksini tapmışdır. Pedaqogika və xüsusi metodikalar sahəsində son illərdə səriştəli yanaşma ideyasının tətbiqi xüsusiyyətlərinin dərk edilməsi önə çəkilmiş və orta məktəb məzununun şəxsiyyət kimi formalaşmasında idraki səriştəliliyə üstünlüyün verilməsi elmi, pedaqoji-psixoloji cəhətdən əsaslandırılmışdır. Ancaq təəssüflər olsun ki, belə nəzəri işləmələr hələlik orta ümumi təhsil sistemində geniş tətbiqini tapmamışdır.

Araşdırmalar əsasında müəyyən edilmişdir ki, belə çatışmazlığın səbəbini aşağıdakı halların hələ də mövcudluğu əsasında izah etmək olar:

• ümumi təhsil sistemində təhsilverənlər-praktikantlar tərəfindən hələ də “Səriştəli yanaşma” anlayışının yeni bir mənaya malik kimi deyil, ümumi təhsildə pozitiv formada istifadə olunan bir moda kimi qəbul edilməsi;

• səriştəli yanaşmada biliyin verilməsi (ötürülməsi) və qəbulu arasındakı prinsipial fərqlərin başa düşülməməsi;

• səriştəli təhsil ideyası ilə təlimin konkret fənn metodikası arasındakı uyğunluğun olmaması və s.

Ona görə də hazırda səriştəli yanaşmanın ümumi orta təhsildə reallaşdırılması instrumentariyasının işlənilməsi və tətbiqi xüsusi əhəmiyyət daşıyır. Bu halda, ümumi təhsil sistemində toplanmış müsbət təcrübədən imtina etmək olmaz. Səriştəli yanaşmanın heç zaman boş bir yerdə formalaşmadığını nəzərə alaraq, müasir təhsilin nəzəri əsaslarını təşkil edən aparıcı kompetensiyalar və yanaşmalarla onun əlaqələrinin üzə çıxarılması həlledici əhəmiyyət daşıyır. Səriştəli yanaşmanın metodiki əsaslarının işlənilməsində, prosesdə hər bir tədris fənninin yerinin müəyyən edilməsində də özünün effektivliyini artıq müəyyən etmiş yanaşmalara və texnologiyalara söykənmək lazımdır. Bundan başqa ümumi orta təhsil məktəbləri və peşə təhsili pillələri arasında varisliyi gözləməklə, nəzərə almaq lazımdır ki, səriştəliliyin bu pillələrdə tətbiqi məqsədini müxtəlif səviyyələrdə təhlil edib, aydınlaşdırmaq lazımdır.

Qeyd etmək lazımdır ki, ənənəvi ümumi orta təhsildə əsas qeyri-müəyyənliklər bir sıra konkret ziddiyyətlərlə şərtlənir:

• tədris fəaliyyətində praktiki-peşəkar motivasiyadan daha çox idraki (dərketmə) motivasiyanın inkişafına üstünlük verilir;

• təlimin məzmunu çoxlu sayda, bir-biri ilə zəif əlaqədə olan fənlərlə müəyyən edilsə də, əmək prosesində də məzmun sistemli formada tətbiq edilir;

• təlim prosesində təhsilalanlar, əsasən, standart məsələlərin həlli ilə məşğul olur;

• təlim prosesində təhsilalanlar passiv, “cavabdeh” mövqeyində olur;

• təlim prosesində isə təhsilalan tədris-təlim prosesi ilə bağlı statistik informasiyanı toplamaqla məşğul olur;

• təlim prosesində, əsasən, fərdiləşmə prinsipinə üstünlük verilsə də, əmək sahəsində istehsal prosesinin bütün iştirakçılarının birgə fəaliyyəti dəyərləndirilir və s.

Ənənəvi ümumi orta təhsildən fərqli olaraq səriştəli yanaşmanın kontekst tipli tədris-təlim prosesinin təşkilinin əsas ideyası ondan ibarətdir ki, təhsilalanların nəzəri biliklərі mənimsəməsinin əsas məqsədinin onların gələcək fəaliyyətinin daha səmərəli təşkili ilə bağlı olmasını önə çəkmək və onların bu istiqamətdə fəaliyyətini inten-

sivləşdirməkdir. Ona görə də təhsilalanların tədris fəaliyyətinin ardıcıl modelləşdirilməsi fənn-texnoloji (konkret kontekst) və sosial (sosial kontekst) tərkib hissələri nəzərə alınaraq həyata keçirilməlidir.

Səriştəli yanaşmanın kontekst tipli təlimin təşkilinin əsas prinsiplərini aşağıdakı kimi qruplaşdırmaq olar:

- təhsilalanın səmərəli tədris fəaliyyətinə cəlb olunmasının psixoloji-pedaqoji təmin edilməsi;
- təhsilalanların tədris fəaliyyətinin məzmununun tamlığını nəzərə alaraq ardıcıl modelləşdirilməsi;
- təlim prosesində öyrənmənin və prosesin məzmununun problemli xarakter daşıdığının əsaslandırılması;
- təhsilalanların tədris fəaliyyətinin təşkili formasının onun məqsədinə və məzmununa adekvat olması;
- təhsilverənlərin (müəllimlərin) və təhsilalanların (şagirdlərin və tələbələrin) təlim prosesinin subyekti kimi birgə fəaliyyətində şəxsiyyətlərarası münasibətlərin və dioloji ünsiyyətin rolunun dəyərləndirilməsi;
- yeni və ənənəvi pedaqoji texnologiyaların uyğunluğunun pedaqoji əsaslandırılması;
- başqa nəzəriyyə və yanaşmalar tərəfindən təklif olunan pedaqoji texnologiyalardan, təlim prosesinin konkret məqsədinin yerinə yetirilməsi üçün istifadədə səmimiliyin qorunması;
- hər bir təhsilalanın fərdi-psixoloji və ailə, milli, dini, coğrafi və s. mədəni kontekst xüsusiyyətlərinin nəzərə alınması;
- təhsilalanın şəxsiyyətində təlim və tərbiyənin birliyinin təmin olunması üçün fəaliyyətin dəstəklənməsi və s.

Deməli, ümumtəhsildə səriştəli yanaşmanın kontekst tipli təlimin təşkilinin əsas məqsədi təhsilalanların tədris fəaliyyətinin tamlığının təmin olunmasının pedaqoji və psixoloji əsaslarının işlənilməsi və səmərəli tətbiqinin həyata keçirilməsində yeni yanaşmalardan, pedaqoji və təlim texnologiyalarından istifadə edərək keyfiyyətli tədris-təlim prosesinin qurulmasıdır. Bu halda təhsilalanın fəaliyyətində aşağıdakı üç baza formasını bir-birindən ayırmaq tələb olunur:

- akademik tipli tədris fəaliyyəti. Buna tədrisdə inmasiya xarakterli klassik mühazirə formasını göstərmək olar;
- qeyri-həqiqi peşə fəaliyyəti. Buna istehsalın məzmunu və dinamikasını kontekst təlimin başqa formalarında, yəni tədris auditoriyalarında modelləşdirilməsinin həyata keçirilməsinə üstünlüyün verilməsini göstərmək olar;
- tədris-peşə fəaliyyəti. Bu halda təhsilalanlar laboratoriyalarda real tədqiqat işləri yerinə yetirir və istehsalat və ya pedaqoji təcrübədə müvafiq praktiki işlərin də icra edilməsini göstərmək olar.

Deməli, ənənəvi təlim formasından fərqli olaraq, kontekst tipli təlim nəzəriyyəsinə uyğun olaraq təhsilalan təlim prosesində fəaliyyətlə bağlı daha geniş və effektli biliklər sisteminə yiyələnmək imkanları qazanır və səriştəlilik səviyyəsini yüksəldir.

Müəyyən edilmişdir ki, təhsilin müxtəlif pillələri arasındakı varislik universal biliklərin, bacarıqların və vərdişlərin, həm də aktiv sərbəst fəaliyyətin və onun nəticələrinə şəxsi məsuliyyətin formalaşması bütöv sistem kimi açar səriştəlilik vasitəsilə həyata keçirilir.

Açar kompetensiyaların komponentlərinin təhlili onlar arasında sıx və qırılmaz əlaqənin olması, açar kompetensiyaların formalaşmasında idraki (dərketmə) səriştəliliyin əsas rol oynadığını müəyyən etməyə imkan vermişdir. Açar kompetensiyalar müxtəlif fəaliyyətlərin məhsuldarlığını və effektivliyini təmin etməklə bərabər, həm də onların koqnitiv bacarıqlar əsasında formalaşdığını müəyyən edir.

İdraki səriştəlilik orta məktəb məzunlarının şəxsiyyət kimi formalaşmasında xüsusi əhəmiyyət kəsb edir. İdraki səriştəlilik, həm də qarşılıqlı əlaqədə olan təhsilalanların yekun keyfiyyət (bilik, bacarıq, qabiliyyət, motiv, fəaliyyət və davranış qaydaları) göstəricilərinin formalaşma səviyyəsinin müəyyən edilməsinə imkan verir.

Elmi ədəbiyyatda idraki səriştəlilik çoxlu sayda definitiv (tamamilə müəyyənedilmiş) anlayışlarla təsvir edilir. Məsələn, V.İ.Baydenkonun tədqiqatlarında ali məktəbin məzunlarının fərdi idraki fəaliyyətində səriştəliliyin xeyli sayda növlərindən istifadə olunur. Buraya dərketmənin metodlarına yiyələnməklə, çətinliklərin dərkolunma bacarıqları və onların aradan qaldırılması; fasiləsiz təhsilə hazır olma; informasiyanın işlənilməsi bacarığı və informasiya texnologiyalarına sahib olma; müxtəlif mənbələrdən informasiyanın alınması və informasiyanın idarə olunması sahəsində bacarıqlar; kompyuterlərlə işləmə vərdişləri; biliyə yiyələnmə bacarığı və s. daxil edilir.

Orta ümumtəhsil məktəblərində S.P.Zaxarov "özünütəhsil sahəsində səriştəlilik", E.H.Koçurovskaya isə "koqnitiv səriştəlilik" anlayışlarından istifadə olunmasını təklif etmişlər. V.E.Qaibova və A.P.Çernyavskaya tədris-idraki (dərketmə) səriştəliliyi həyatı boyu təhsilalma, biliklərə, bacarıqlara və vərdişlərə yiyələnmə kimi təsfir (izah) edirlər. S.Q.Vorovşikov isə tədris-idraki səriştəliliyi fərdin dərketmə fəaliyyətini başa düşməsi, anlaması kimi qəbul olunmasının tərəfdarı olmuşdur. Eyni zamanda, müəllif ümumi orta təhsilin yuxarı sinif şagirdlərində tədris-idraki kompetensiyanın inkişafının idarə olunması problemini tədqiq edərək, bu problemə üç səviyyədə baxılmasını təklif etmişdir:

- şagird şəxsiyyəti akademik mobilliyin əsas faktoru kimi. Yəni şagirdin məktəbdə müvəffəqiyyətlə təhsil alması və ali təhsil müəssisələrində təhsilini davam etdirməyə hazır olması;
- şagird şəxsiyyəti peşəkar mobilliyin əsas faktoru kimi. Yəni şagirdin müasir fasiləsiz təhsil siyasətinin reallaşdırılmasına, peşə almaya, ixtisasını artırmağa hazır olması;
- şagird şəxsiyyəti məktəbdə tədris-təlim prosesinin effektivliyinin təminedici faktoru kimi. Yəni təhsilalanların ümumi təhsil proqramlarının effektiv reallaşdırılmasına və sosial institutların fəaliyyətinin səmərəliliyinin yüksəldilməsinə hazır olması.

Beləliklə, belə nəticəyə gəlmək olar ki, idraki səriştəlilik, mahiyyət etibarilə formalaşmış bacarıqların yeniləşdirilməsinə istiqamətlənmiş səriştəlilikdir. Onu da qeyd etmək lazımdır ki, bəzi tədqiqatçılar tərəfindən iddia edilir ki, guya ümumi təhsildə kontekst tipli təlim şəxsiyyətin müvəffəqiyyətlə sosiallaşmasında biliyin mühüm rolunu inkar edir. Bu yanlış fikir onunla bağlıdır ki, ənənəvi təhsildə biliyə yaddaşda saxlanılan və elmin əsas faktlarını və ondan irəli gələn nəzəri ümumiləşmələri yenidən hasiletmə bacarıqları kimi baxılmasıdır. Kompetensiyalı bilik ölü bir yük kimi yaddaşda qalan bilik olmayıb, yeni biliklərin qazanılmasında əsas rol oynayır. Biliyin belə təfsir olunması bacarıqlarla, eyni zamanda şəxsiyyətin dəyər-məna və requlyativ-iradi keyfiyyətləri ilə bağlıdır. Ona görə də səriştəli yanaşmaya həm peşə-ixtisas təhsilində, həm də ümumi orta təhsildə, yalnız tətbiqi və təcrübi xarakterli ideyaların gücləndirilməsi kimi baxmaq olmaz. Nəzəri biliklərin kortəbii tətbiqinin təcrübi-istiqamətlənmiş (səmtləşdirilmiş) biliklərlə əvəz olunması, nəinki təhsilin fundamentallığına ziyan gətirir, eyni zamanda təhsilalanlarda açar kompetensiyaların formalaşmasının təmin olunmasına zəmanət verə bilmir. Nəzəri biliklərin təcrübi biliklərə çevrilməsinin

təmin olunmasının, bu biliklərin praktik situasiya və problemlərin, hadisələrin izahında təcrübi vasitəyə çevrilməsinin əsasının qoyulması müəyyənedici göstərici hesab edilməlidir. Ona görə də səriştəli yanaşma şəxsiyyətin ayrı-ayrı sahələrdə bacarıqlarının inkişaf etdirilməsində nəinki nəzərə alınmalı, eyni zamanda inkişaf etdirilməlidir.

Yaradıcı və təşəbbüskar insanlara cəmiyyətin tələbatı onların bacarıqlarını müxtəlif fəaliyyət sahələrində inkişaf etdirərək, cəmiyyət üçün layiqli vətəndaş olmalarının təmin edilməsi ilə bağlıdır. Orta ümumi təhsil məktəblərində tədris-təlim prosesində yalnız istedadlı uşaqların üzə çıxarılması istiqamətində işi qurmaq düzgün deyildir.

Ümumi orta təhsil sistemində səriştəli yanaşmanın belə variantda tətbiqi ənənəvi tədris-təlim prosesini dağıtmır, sistemə xas olan yaxşı nə varsa, onları saxlayaraq, sistemin modernləşməsini həyata keçirir. Ümumi orta təhsildə tədris-təlim prosesinə xas olan elmilik, fərdi-fəaliyyət xarakter daşıması, orta məktəb məzunlarının rəqabətəqabillik, rəqabətədözümlülük prinsipləri əsasında formalaşmasının təmin olunması istiqamətində səmərəli fəaliyyətin saxlanılması və inkişaf etdirilməsi daha ciddi formada davam etdirilməli və orta təhsildə pedaqoji prosesin təşkilinin səriştəlilik kontekstində həyata keçirilməsinə üstünlük verilməlidir.

## İstifadə edilmiş ədəbiyyat

**1. "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası".// Azərbaycan məktəbi, 2013, №5.**

**2. Байденко В., Оскарсон Б. Базовые навыки (ключевые компетенции) как интегрирующий фактор образовательного процесса. //М.: Педагогика, 2002.**

**3. Захаров С. Роль учителя в формировании самообразовательной компетенции. Режим доступна: htpp: // academy. edu. By/conf_2008/ tezisy/ Zaxarov.os.**

**4. Когуровская Е. Формирование мотивационного компонента когнитивной компетентности школьников посредством нестандартных задач. // Вестник Бурятского гос. ун-та, 2009, № 35.**

**5. Гаибова В., Чернявская А. К определению общих учебных компетентностей старшеклассников. // Инновации в образовании, 2006, №5.**

**А.Мехрабов**

**Полное общие образование в контексте компетентностного подхода**

**Резюме**

**Статья посвящена особенностям внедрения компетентностного подхода в систему школьного образования. Раскрываются аспекты, которые следует учитывать при разработке инструментария компетентностного подхода в школьное образовании. В качестве важных требований к личности выпускника школы выделяется познавательная компетентность.**

**A.Mehrabov**

**Complete general education in the context of the competency approach**

**Summary**

**The article is devoted features of introduction of competence approach in the school system. Revealed aspects that should be considered in the development of tools competence approach in school education. As important to the individual requirements of the graduate school is allocated cognitive competence.**



# KEYFİYYƏTİN İDARƏ OLUNMASININ BƏZİ ASPEKTLƏRİ BARƏDƏ

**Firədun İbrahimov,**
***AMİ-nin Şəki filialının professoru***

***Açar sözlər:** təhsil sahəsində keyfiyyət, səmərəli idarəetmə sistemi, keyfiyyətin qiymətləndirilməsi üsulları, təhsil fəaliyyətinin nəticələri, sistemli fəaliyyət, koqnitiv komponent, refleksiv komponent, kommunikativ komponent.*

***Ключевые слова:** качество в сфере образования, система рационального управления, методы оценки при оценивании качества, результаты образовательной деятельности, системная деятельность, когнитивный компонент, рефлексивный компонент, коммуникативный компонент.*

***Key words:** the quality on education, efficient controlling system, methods of evaluating of quality, results of educational action, systematic action, cognitive component, reflexive component, communicative component.*

Təhsilin inkişafı problemləri hamını-ölkə miqyasında idarəetmə qərarlarını qəbul edən icra orqanından tutmuş, təhsil müəssisəsi rəhbərlərini, elmi işçiləri, dərslik müəlliflərini, metodistləri, müəllimləri, bir sözlə, müxtəlif səviyyələrdə təlim-tərbiyə prosesini təşkil edənləri və nəhayət, valideynləri, bütün ictimaiyyəti narahat edir, düşündürür, onların həlli yollarını axtarmağa məcbur edir. Təhsilin inkişaf etdirilməsi ilə bağlı problemlərdən biri, bəlkə də, birincisi, müasir zamanın çağırışlarına adekvat keyfiyyətli təhsilin bərqərar olunması və onun idarə olunmasıdır.

Təhsil sahəsində keyfiyyət dedikdə, təhsilin nəticələrinə uyğun əvvəlcədən müəyyən edilmiş normativlərə müvafiq öyrənənlərin səviyyəsi, ümumi halda isə təhsil sisteminin durumu başa düşülür. Keyfiyyət istənilən obyektin, o cümlədən təhsilin müəyyənliyini bildirən fəlsəfi kateqoriya olub, onun xassələrinin məcmusunda təzahür edən obyektiv və ümumi xarakteristikadır. Keyfiyyət istənilən prosesin elə bir müəyyənləşdiricisidir ki, onun sayəsində proses başqa proses kimi yox, məhz həmin proses kimi çıxış edir və digər proseslərdən fərqlənir.

Tarixən təhsil müəssisələrində təhsilin nəticəsini, keyfiyyətini qiymətləndirmək məqsədi ilə aşağıdakı kimi kvalimetrik (təsviredici) metodikalardan istifadə olunub:

- müəllimlər tərəfindən müəyyənləşdirilmiş proqnozun əldə edilməsi;
- şagirdin həyatında həmişə baş verən eksterimal situasiyalarda şagirdlərin əxlaqının qiymətləndirilməsi;
- müəllimlər tərəfindən düşünülmüş və təşkil edilmiş diaqnostik situasiyalarda şagirdlərin əxlaqının qiymətləndirilməsi;
- məktəbin özü tərəfindən hazırlanmış kriteriyalar şkalası üzrə nəticələrin qiymətləndirilməsi;
- psixoloji göstəricilərin, şagirdin həyatında istifadə edilən hər cür hərəkətin, fəaliyyətin qiymətləndirilməsi: necə etməyi

bilir (intellektual göstərici); həyata keçirməyi bacarır (iradi göstərici); reallaşdırmaq istəyir (emosional göstərici).

Müstəqillik qazanıldıqdan sonra təhsilimizdə keyfiyyətin yüksəldilməsinə və onun səmərəli idarəolunma modellərinin elmi əsaslarının işlənilməsinə münasibət dəyişmiş və sözügedən yönümdə iş daha konstruktiv xarakter almışdır. Müasir təhsil konsepsiyası təfəkkürün inkişafını şagirdlərin əqli inkişafının başlıca məqsədi sayır (1;54).

Müasir dövrdə təhsilin keyfiyyətinin cəmiyyətin aktual problemi kimi qəbul edilməsinin əsas səbəblərini aşağıdakı iki obyektiv halla izah etmək olar:

- Keyfiyyətli təhsil sisteminin qurulması ilə təhsil fəaliyyətinin bütün subyektləri - öyrənənlər, valideynlər, pedaqoqlar, təhsil sisteminin səmərəli idarəolunması ilə müxtəlif səviyyələrdə məşğul olan rəhbər və başqa işçilər maraqlanırlar. Son zamanlar təhsilalanlar üçün keyfiyyətli təhsil sisteminin qurulmasına diqqət daha da artmaqdadır. İstər cəmiyyət, istərsə də dövlət vətəndaşların keyfiyyətli tədris prosesi ilə əhatə olunmasında çox maraqlıdır;

- Ümumtəhsil məktəbləri hazırda təlim prosesinin profilləşdirilməsi, innovatik xarakterli yanaşmaların tətbiqi, yeni pedaqoji və təlim texnologiyalarından səmərəli istifadə, yeni dərslik və dərs vəsaitlərinin, tədris proqramlarının, tədris-metodik komplekslərin seçim imkanlarına görə bir-birindən fərqlənir. Belə müxtəlifliklərin son illərdə təhsil sistemində daha geniş yer aldığı bir şəraitdə təhsilin keyfiyyətinin stabilləşdirici rolu prosesin səmərəli idarə olunmasına geniş imkanlar açır. Ona görə də hazırda valideynlərin və öyrənənlərin təhsil müəssisələrini sərbəst seçməyə olan meyilləri daha da genişlənir, həm də öyrənənin hazırlanmasında, tələblərin yerinə yetirilməsində təhsil müəssisələrinin məsuliyyəti artır.

Elmi-pedaqoji mənbələrdə göstərilir ki, təhsildə keyfiyyətin idarə olunmasının effektivliyini təmin edən pedaqoji prinsipləri aşağıdakı kimi qruplaşdırmaq mümkündür:

1. İdarəolunan sistemin səmərəliliyinin əsas göstəricisi kimi "təhsilin keyfiyyəti" anlayışı haqqında məlumatların dəqiqliyi (əgər idarəolunan obyekt (sistem) dəqiq müəyyən edilməmiş olarsa, onda idarəetmənin mənası itir, əgər idarəolunan obyekt yarımçıq müəyyənləşdirilərsə, bu halda idarəetmə səmərəsiz olur, təhsil sisteminin və ya təhsil müəssisələrinin fəaliyyətində heç bir müsbət irəliləyiş əldə edilmir);

2. Təhsilin keyfiyyətinin səmərəli idarəolunma sisteminin idarə etmənin ümumi qanunlarına uyğunluğu;

3. Təhsilin keyfiyyətinin səmərəli idarəolunma sisteminin tədris-təlim prosesinin qanun və qanunauyğunluqlarına müvafiqliyi (6; 46-47).

Professor A.O.Mehrabov yazır ki, təhsilin keyfiyyətini idarə etmək üçün istifadə olunan yanaşmaların təhlili aşağıdakı nəticələrə gəlməyə əsas verir:

- keyfiyyətin idarə olunmasını təmin etməkdən ötrü idarəolunan hər bir obyekt üçün o anlayışın məna tutumu qabaqcadan müəyyən edilməlidir;

- təhsilin keyfiyyətinin bütün təhsil sistemi üçün eyni olan ümumi, eyni zamanda hər bir idarəolunan obyekti xarakterizə edən və müvafiq xassəyə malik xüsusi elementləri özündə cəmləşdirdiyi nəzərə alınmalıdır;

- təhsilin keyfiyyəti mürəkkəb struktura malik olduğundan, onun idarəolunma üsulları barədə yekdil fikir formalaşmadığından, istənilən təhsil sistemi və təhsil müəssisəsi üçün onun ümumi tərifini və geniş şərhini dəqiq vermək mümkün deyildir.

Təhsil sistemindən istifadə edən konkret istehlakçının tələbləri təhsil sisteminin fəaliyyəti ilə birbaşa bağlı olan təhsilin keyfiyyətinin əsas məzmununu müəyyən edir. Bu tələblərə fəaliyyətin bütün parametrləri tabe olur. Çox hallarda təhsil sistemi, eyni zamanda bir neçə istehlakçı ilə işləməli olur. Belə hallarda hansı istehlakçının tələblərini yerinə yetirmək, hansı tələbləri təhsilin keyfiyyətinin müəyyən edilməsində əsas kimi götürmək çox əhəmiyyətlidir. Aparılan təhlillər göstərir ki, belə hallarda öyrənənlərin tələblərinin yerinə yetirilməsi məntiqidir. Məhz belə yanaşma şagirdə istiqamətlənmiş təhsilin qurulmasının tələblərinə cavab verir. Burada qüvvədə olan norma və standartlarda, artıq ictimai və dövlət statusu almış çoxlu sayda tələblər ümumiləşdirilməlidir. Öyrənənləri eyni və ya oxşar tələblərə görə qruplaşdırmaq lazımdır. Bu tələblər təhsilin keyfiyyətinin müəyyən hissəsini özündə cəmləşdirir və onun məzmununu müəyyən etməyə imkan verir.

Təhsildə keyfiyyətin qiymətləndirilməsi ilə bağlı bir çox üsullardan istifadə olunur. Bunlara aşağıdakıları daxil etmək olar:

- təhsil müəssisələrinin lisenziyalaşdırılması;
- pedaqoji işçilərin və təhsil müəssisələrinin attestasiyası;
- öyrənənlərin aralıq və yekun attestasiyası;
- təhsil müəssisələrinin tədris və digər fəaliyyətinin auditi;
- professional, peşəkarlıqla bağlı müsabiqələr (3; 216).

Bu məsələlər içərisində təhsildə keyfiyyətə nəzarət və onun durumunun müntəzəm təftiş edilməsi xüsusi yer tutur. Bu halda istənilən prosesin keyfiyyətinin qiymətləndirilməsi və bircins obyektlər üçün yeni qiymətləndirmə kriteriyalarının müəyyənedilmə prosedurları əsas kimi götürülür.

Təhsilin keyfiyyətinin effektiv idarəolunma sisteminin formalaşdırılmasında "prosesə" və ya "nəticəyə" görə idarəetmə ilə bağlı yanaşmaların hansına üstünlüyün verilməsi xüsusi əhəmiyyət daşıyır. Bəzi yanaşmalarda təklif olunur ki, təhsil müəssisələrində baş verən prosesləri-əsas, idarəolunan və yardımçı kimi üç qrupa bölmək mümkündür. Əsasa elmi-metodik və elmi-tədqiqat işlərini; idarəolunmaya strateji planlaşdırmanı, istehlakçıların tədris fəaliyyətinin nəticələrindən istifadə səviyyəsinin qiymətləndirilməsini; yardımçıya isə material təminatını, maliyyənin və infrastrukturun idarə olunmasını daxil etmək olar.

Bəzi tədqiqatçılar təhsilin nəticələrini məhz belə yanaşmalarla müəyyənləşdirmiş və aşağıdakıları əsas götürmüşlər:

- şagirdlərin bilik, bacarıq və vərdişlərini;
- öyrənənin şəxsi inkişaf prosesinin göstəricilərini;
- tədris-təlim prosesinə təsir edən mənfi təsirlərin aradan qaldırılmasına dair işlənilmiş effektiv yanaşmaları;
- şagirdlərin səriştəlilik səviyyəsini.

Bəzi tədqiqatçılar isə təhsilin nəticələri kimi aşağıdakıları ön plana çəkirlər:

- şəxsiyyətin yüksək özünüdərkini;
- fiziki və mənəvi sağlamlığını;
- yüksək təhsilliliyini, özünün təhsilə olan tələbatını və vərdişlərini;
- yüksək tərbiyəliliyini;
- vətənpərvərlik və yüksək vətəndaşlıq mövqeyini.

Başqa qrup tədqiqatçılar isə təhsilin nəticəsi kimi, təhsilini başa vurmuş öyrənənlərdə aşağıdakı parametrləri özündə birləşdirən təhsillilik səviyyəsini əsas göstərici kimi qəbul edirlər:

- bilik, bacarıq və vərdişləri;
- mədənilik səviyyəsini;
- mənəvi inkişafı, dəyərlilik göstəricilərini;
- orqanizmin intellektual və fiziki inkişafının imkanlarını.

Aparılmış təhlillər göstərir ki, ümumi idarəetmənin qanunlarını nəzərə almadan təhsilin keyfiyyətinin idarə olunma sisteminin qurulması, keyfiyyətin idarə olunmasının səmərəliliyi təmin edilə bilməz. Təhsilin keyfiyyətinin effektiv idarəolunma sisteminin metodoloji əsasının yaradılmasında “sistemli fəaliyyət”i təmin edən yanaşmadan istifadə olunmalıdır. Ümumi halda təhsilin keyfiyyətinin idarəolunma sisteminin strukturu idarəedən və idarəolunan altsistemlərin cəmindən ibarət olmalıdır.

Təhlillərdən belə qənaət hasil olur ki, bu halda informasiya xarakterli məlumatı qəbul edən idarəolunan sistemdə aşağıdakı hallar baş verə bilər:

- idarəolunan altsistemin fəaliyyətinin keyfiyyəti yüksəlir;
- idarəolunan altsistemin fəaliyyətində heç bir dəyişiklik baş vermir;
- idarəolunan altsistemin fəaliyyətinin keyfiyyəti aşağı düşür.

Təhsilin keyfiyyətinin səmərəli idarə olunmasının əsas şərti idarəedən və əlaqənin düzgün qurulmasıdır. Bu halda aşağıdakı tələblər ödənilməlidir: tamlıq, münasiblik, adekvatlıq, obyektivlik, əlverişlilik, fasiləsizlik, strukturlaşmalıq (6; 34).

İdarəedən altsistemin strukturu təhsilin keyfiyyətinin mənasını müəyyənləşdirən amillərin kombinasiyasından asılı olub aşağıdakıları özündə birləşdirir:

- təhsilin keyfiyyətinin qiymətləndirilməsi üsullarını;
- təhsil sistemində baş verən prosesləri;
- təhsil fəaliyyətinin subyektlərini;
- təhsil fəaliyyətinin nəticələrini;
- təhsil fəaliyyətinin həyata keçirildiyi şəraiti (3; 218-219).

İdarəolunan obyektə (sistemə) nəzərən idarəetmənin subyektləri ardıcıl olaraq müəyyən idarəetmə funksiyalarını yerinə yetirirlər: məqsədli təhliletmə; planlaşdırma; nəzarət; təshihetmə və yenidən təhlil. Təlim keyfiyyətinin idarə edilməsi funksiyaları sırasında planlaşdırmanın mühüm əhəmiyyəti xüsusi vurğulanmalıdır. Hər bir məqsədin əldə edilməsi (nəticə kimi sonuclanması) onun həyata keçirilməsi üsullarının seçilməsindən, prosesin ardıcıllığının təmin edilməsi üsullarının düşünülmüş şəkildə həyata keçirilməsi addımlarının təyin edilməsindən asılıdır.

Təhsilin keyfiyyətinin əldə edilməsi, nəticələrə istiqamətlənmiş idarəetmənin quruluşu müvafiq əməliyyatlardan formalaşır. Burada vəzifə və məqsədlərin həyata keçirilməsi, lazımi nəticələrin əldə edilməsi idarəetmə strategiyasının seçilməsindən asılıdır. Məktəbin innovasiya rejimində işləməsi, yenilikləri mənimsəməsi və tətbiqi üçün üç əsas inkişaf strategiyası bəllidir: lokal, modul, sistemli.

Strategiya sistemli dəyişikliklər strategiyasıdır. Bu zaman söhbət təhsilin keyfiyyətinin idarə olunmasında son nəticələrə təsir göstərə biləcək bütün faktorların, yeniliklərin, dəyişmələrin əlaqələndirilmiş və planlı şəkildə həyata keçirilməsindən gedir. Burada tətbiq edilən yeniləşmələr koordinasiya olunmalı, təhsil müəssisəsinin inkişaf proqramı hazırlanmalıdır. Sistemli dəyişikliklərin yenidənqurma proqramı o zaman hazırlana bilər ki, məktəb rəhbərləri, bütün pedaqoji kollektiv innovasiya proseslərinin tətbiqi, təşkili, təcrübəsi ilə tanış olsunlar, eksperimentlər qoymaq metodikasına yiyələnsinlər. Unutmaq olmaz ki, strategiya seçimi həm də tətbiq ediləcək yeniliklərin xarakterindən, mürəkkəbliyin-

dən, həcmindən də asılıdır.

Təhsilin keyfiyyəti məqsəd və nəticənin münasibəti kimi dərk oluna bilər. Təhsildə yüksək keyfiyyət əldə etmək üçün mürəkkəb və çətin olsa da, optimal həyata keçirilməsi mümkün olan məqsəd müəyyənləşdirilməlidir. Daha sonra həmin məqsədə çatmaq üçün təhlil prosesində qarşıya çıxan nöqsanlar araşdırılır. Bu nöqsanlara aşağıdakı amilləri aid etmək olar: köhnəlmiş, qeyri-optimal, təhsilin məzmununa xeyir gətirməyən, yaxud da əhəmiyyətini itirmiş təlim-tərbiyə və inkişaf texnologiyaları, yaxud şagirdlərin təlim prosesinə zəif cəlb edilməsi və s. Bundan sonra aydınlaşdırılır ki, təhsil prosesində özünü büruzə verən nöqsanlar hansı şəraitdə yaranmışdır. Onlara, əsasən, aşağıdakılar aid edilə bilər: elmi-metodik şəraitin nöqsanları; yüksəksəviyyəli müəllim kadrlarının çatışmazlığı; maddi-texniki bazanın tələbləri ödəməməsi; maliyyələşmədə nöqsanlar.

Təhsildə keyfiyyətin təmin edilməsi və onun səmərəli idarə olunması, öyrənənlərdə yeni peşəkarlıq kompetensiyalarının formalaşdırılması üçün təlimin məzmununa və metodlarına yeni yanaşmaların tətbiqini tələb edir. Bu halda peşəkarlıq kompetensiyalarının strukturuna aşağıdakı komponentləri daxil etmək lazımdır: koqnitiv; tənzimləyici (yönəldici); kommunikativ; fərdi (şəxsi); refleksiv (qeyri-iradi).

Aparılmış təhlillər göstərir ki, peşəkar kompetensiyaların komponentləri refleksiv proseslərin təsiri nəticəsində formalaşır. Ona görə də qeyri-iradi komponentin aşağıdakı formalarını bir-birindən ayırmağı bacarmaq lazımdır:

- retrospektiv (keçmiş təcrübənin tənqidi anlaşılması, dərk edilməsi);
- situativ (cari vəziyyətin, situasiyanın real qiymətləndirilməsi);
- perspektiv (fəaliyyətin nəticələrini qabaqcadan görmək, əxlaq, davranış normalarının optimal strategiyasının dərk olunmuş variantının seçilməsi və s.).

Bu komponentlər öyrənənin refleksiv prosesləri səmərəli həyata keçirməsinə və yüksək refleksiv özünütəşkilə geniş imkanlar açdığından, tədris prosesində bunlar nəzərə alınmalı və belə keyfiyyətlərin formalaşdırılması təmin edilməlidir (3, 222).

Təcrübə göstərir ki, təhsildə keyfiyyətin təmin olunması və onun effektiv idarəedilməsinə yeni yanaşmaların tətbiqinin ön plana çəkilməsi, hazır biliklərin mexaniki transilyasiyasına yol verilməməsi, peşəkarlıq sahəsində aktivliyin yüksəlməsində yaradıcı xarakterli axtarışların həyata keçirilməsinə müvafiq şəraitin yaradılması vacibdir.

Təhsilin keyfiyyəti vaxtaşırı dəyişən bir kateqoriyadır və o, dövrümüzün çağırışları əsasında sosial sifarişçilərin tələbatlarına uyğun olaraq dəyişir, yeniləşir. Bu reallıq tələb edir ki, təhsilin nəticələrinin monitorinqi sistematik olaraq həyata keçirilsin, keyfiyyətin yüksəlməsi üçün axtarışlar edilsin (7).

Fasiləsiz, real, müvafiq yoxlama və qiymətləndirmə proqramları müəllimləri və valideynləri hər bir şagirdin təlim nəticələri və müvəffəqiyyətləri haqqında dəlillərlə təmin edir. Bu cür obyektiv informasiya şagirdlərə, müəllimlərə, ailə üzvlərinə şagirdlərin təlim məqsədlərini dəqiq müəyyənləşdirməyə və təhsilin növbəti pilləsini dəqiq planlaşdırmağa imkan verir. Şagirdlərin topladıqları balları ayrılıqda götürdükdə onların fəaliyyətlərini qiymətləndirmək şagirdlərin öz məqsədlərinə nə dərəcədə nail olduqlarını müəyyənləşdirmək üçün kifayət deyildir. Şagirdlər şəxsi məqsədləri müəyyən etmək, öz fərdi inkişafını izləmək və nail olduğu bilik, bacarıq və vərdişlər üzərində düşünmək imkanlarına malik olmalıdırlar. Şagirdlərin təlim müvəffəqiyyətlərini qiymətləndirmək vasitələri də

öyrətmə funksiyası kəsb etməli, onlara öz təlim nəticələrini başa düşməyə kömək etməlidir. Yoxlama və qiymətləndirmə meyarları şagirdlərin öyrənmə fəaliyyətlərini həm işin nəticəsi, həm də prosesin özü kimi qiymətləndirməsinə, şagirdlərin fərqli və fərdi xüsusiyyətlərinin aşkar edilməsinə xidmət göstərməlidir. Qiymətləndirmə bir şagirdin başqa şagirdə münasibətdə necə oxumasını müəyyənləşdirməyə xidmət etməməli, şagirdin öz fərdi inkişaf səviyyəsini üzə çıxarmalı, bu zaman xarici motivlərə istinad etməməlidir (6).

Təhsil sistemimizdə keyfiyyətli tədris-təlim prosesinin qurulması və onun effektiv idarə olunması üçün yeni pedaqoji texnologiyaların, interaktiv təlim metodlarının elmi, pedaqoji-psixoloji, metodiki əsaslarının işlənilməsi və onların nəticələrinin pedaqoji prosesə gətirilməsi təmin olunmalıdır.

*Rəyçi: prof. H.Əlizadə*

## İstifadə edilmiş ədəbiyyat

**1. Əlizadə Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı: Pedaqogika, 2004, 432 s.**

**2. Ağayev Ə. Seçilmiş pedaqoji əsərləri. 2 cilddə, I cild, 2010.**

**3. Mehrabov A. Müasir təhsilin konseptual problemləri. Bakı: Mütərcim, 2010, 516 s.**

**4. Болошов В. Системы качества образование. М.: Пед.Общество Росии, 2000, 214 с.**

**5. Нейматов Я. Образование в XXI веke: тенденции и прогнозы. М.: Алгоритм, 2002, 480 с.**

**6. Поташник М., Ямбир Е., Матрос Д. Управление качеством образование (под ред. М.Поташника). М.: Педагогическое общество, 2000.**

**7. Шишов С. Мониторинг качества образования в школе. М.:Пед. Общество Росии, 1999.**

**Ф.Ибрагимов**

### О некоторых аспектах управления качеством общего образования

### Резюме

**В статье разъясняется понятие “качество образования”, подчеркивается его роль в повышении интереса общества к обучению.**

**Автор обращает внимание на принципы, обеспечивающие повышение эффективности управления качеством обучения, указывает на факторы, характеризующие понятие “качество образования”.**

**В статье также отмечается важность применения новых подходов к содержанию и методам обучения, чтобы обеспечить качество образования и формирование профессиональных компетенций у обучающихся.**

**F.Ibrahimov**

### Some aspects of quality management

### Summary

**It is explained the conception of quality on education, and the quality of education is appreciated as an actual problem which caused the curiosity of society.**

**The author attracts the principles which ensuring the effectiveness of controlling the education, and shows the factors which characterizing the conception of the quality of education.**

**It is also shown the ensuring the quality on education, applying the new professional competencies approaches to the content and method of education for formulating professionalism ability on learners.**

***İnnovasiyalar***

# İNFORMASİYA CƏMİYYƏTİNDƏ TƏHSİL



**Tofiq Məmmədov,**
***Naxçıvan Müəllimlər İnstitutunun dosenti***

***Açar sözlər:*** ***informasiya, innovasiya, təhsil, texnologiyalar.***
***Ключевые слова:*** ***информация, инновация, образование, технологии.***
***Key words:*** ***information, innovation, education, technologies.***

Elmi-texniki tərəqqi, informasiya inqilabı, yeni ictimai quruluş – İnformasiya Cəmiyyətinin (İC) formalaşması informasiyanı, biliyi, sosial-iqtisadi inkişafın əsas amilinə çevirir. İnformasiya Cəmiyyətinin əsas kapitalı bilik, informasiya və bu informasiyanın daşıyıcısı şəxs (insan kapitalı) olub, yeni keyfiyyətli biliyə əsaslanan iqtisadiyyatın yaranmasını, mükəmməl innovasiya siyasətinin bərqərar olmasını tələb edir. Belə iqtisadi inkişafın təməli təhsil sistemində, onun müasir məzmunu və səmərəli təşkili texnologiyaları vasitəsi ilə qoyula bilər. İnformasiya Cəmiyyəti haqqında bu gün çox yazılsa da, yüksək səviyyədə beynəlxalq sammitlər keçirilsə də (Cenevrə, Tunis sammitləri), İnformasiya Cəmiyyəti nədir? sualına birmənalı cavab yoxdur. Avropa İttifaqı daha çox bu termin altında "biliyə əsaslanan iqtisadiyyatlı cəmiyyət" başa düşdüyünü bildirir, BMT və ABŞ isə "Qlobal İnformasiya Cəmiyyəti" mənasını dəstəklədiyini bildirir. Fikrimizcə, hər iki ideyanın inkişafı nəticəsində bu nöqteyi-nəzərlər bir ortaq nöqtədə konsentrasiya olacaq.

İnformasiya Cəmiyyətinə səmərəli keçid aşağıdakı amillərdən daha çox asılıdır:

- İnformasiya Cəmiyyətinə keçid zərurəti ölkənin müxtəlif sosial qrupları, xüsusən də elitası tərəfindən dərk edilməli, bu zərurət milli ideya səviyyəsinə yüksəlməlidir.

- İnformasiya Cəmiyyətinə keçid dövlət və özəl sektorun geniş maliyyə və intellektual sahəsinin yaradıcı mütəxəssislərinin cəlb edilməsi ilə mümkün ola bilər.

- Ölkə üzrə elmi potensiala uyğun İC inkişafının öncül istiqamətləri müəyyən edilməli, resurslar bu prioritet istiqamətlərdə səfərbər olunmalıdır.

Yuxarıda qeyd edilən birinci amil–İC-nə keçid zərurəti ölkənin elitası tərəfindən dərk edilməlidir tezisi Azərbaycan Respublikasında yüksək səviyyədə öz müsbət siyasi həllini tapmışdır. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin İC-nə keçidə həsr edilmiş ümumdünya Cenevrə sammitində iştirakı və dərin məzmunlu məruzəsi, "Azərbaycan Respublikasında ümumtəhsil məktəblərinin İKT ilə təminatı Dövlət Proqramı"nın, "Elektron Azərbaycan Dövlət Proqramı"nın qəbul edilməsi kimi mühüm dövlət əhəmiyyətli tədbirlər, respublika rəhbərliyinin bu sahəyə ciddi diqqət yetirməsini sübut edir. Azər-

baycan Respublikasının Prezidenti cənab İlham Əliyev çıxışlarının birində qeyd etmişdir: "Dünyanın ən qabaqcıl texnologiyaları Azərbaycanda tətbiq olunmalıdır. Bu bir daha onu göstərir ki, bizim ölkəmiz dünyada gedən proseslərə çox açıqdır. Ölkəmizi müasirləşdirməliyik. Çünki müasir dünyada hər şeyi bilik, savad, təhsil həll edir. İnkişaf etmiş ölkələrin təcrübəsinə nəzər salsaq görərik ki, orada tərəqqini müəyyən edən neft-qaz yox, məhz bilik, texnologiyalar, təhsildir. Ona görə neft-qaz sahəsindəki uğurlar, o sahədən əldə edilən gəlirlər Azərbaycanın hərtərəfli inkişafına xidmət etməlidir. İnfrastruktur inkişafını təmin etmək üçün biz sərmayəni öncə təhsilə, biliyə, gənclərimizin maariflənməsinə yönəltməliyik. Azərbaycanda ən yüksək texnologiyalar tətbiq edilməlidir, biz buna nail olacağıq".

İC-nin inkişafı yeni, aktual elmi bilik yaratmaq, zəruri məlumatları operativ əldə etmək, onları yerli xüsusiyyətlərə uyğunlaşdırmaq, bu bilikləri daha tez, daha səmərəli istifadə etmək kimi məsələləri gündəmə gətirir. Bu gün də respublikada perspektiv milli innovasiya siyasətinin formalaşmasına ehtiyac var. Hazırda respublikada bu istiqamətdə ciddi işlər gedir. Respublikada perspektiv milli innovasiya siyasətinin formalaşması, texnoparkların yaradılması məqsədilə bu sahədəki real vəziyyətin monitorinqinin aparılmasına ehtiyac var. İC-nin inkişafı ilə əlaqədar nəzərə çarpan mühüm amillərdən biri innovasiya anlayışının yeni məna kəsb etməsidir (ümumiyyətlə, bu anlayış elm üçün yeni deyil). İnnovasiya əmtəə, mal, xidmət, texnologiya formasında reallaşan yenilik, ideya, yeni informasiyadır (texnoparklar isə innovasiyaların tətbiqi üçün poliqondur). Sənaye cəmiyyətində innovativ ideyalar aşağıdakı mərhələlərlə formalaşır (İC-də bu mərhələlər, təbii ki, fərqli ola bilər): fundamental və tətbiqi tədqiqatlar; təcrübi-sınaq layihələri; sınaq istehsalı (eksperimental sınaqlar); kütləvi istehsal: satış. Yalnız sonuncu mərhələdə (satış prosesində) innovasiya real mənfəət gətirir, yeniliyin mərkəzindəki ilkin bilik pulla mübadilə edilir (yenilik cəmiyyət tərəfindən qəbul edilir). Biliyə əsaslanan iqtisadiyyatda innovasiya prosesləri (yeni biliyin istehsalı, əldə edilməsi, yayılması, praktik tətbiqi) sosial iqtisadi inkişafın əsas hərəkətverici qüvvəsidir. Ayrı-ayrı ölkələrin iqtisadiyyatında fəal innovativ müəssisələrin payı müxtəlifdir. Belə ki, Rusiya Federasiyasında (RF) bu pay 9% olduğu halda, Avropa İttifaqı ölkələrində 50% (Almaniyada 60%) təşkil edir. Elmi-tədqiqat, təcrübi konstruktor işlərinə inkişaf etmiş ölkələr ÜDM-in 2-4% həcmində investisiya qoyurlar. Bu sahənin intensiv inkişafı vençur (riskli biznes) maliyyə sistemi, əqli mülkiyyətin səmərəli müdafiəsi, innovasiyaya yardım infrastrukturunun formalaşması kimi amillərdən asılıdır. İnnovasiya amili İC-nə keçidin maraqlı bir xüsusiyyətini aşkar edir: bu gün daha çox elmi informasiya istehsal edən ölkələr yox, bu informasiyadan səmərəli istifadə edən, onları praktikada operativ tətbiq edən ölkələr intensiv inkişaf edir. Sənaye üçün innovativ biliklərin, informasiyaların hansı regionda yaranmasının əhəmiyyəti azdır (elmin vətəni olmaz), əsas olan bu ideyalardan operativ, səmərəli istifadə bacarığıdır. Bu gün Çin Xalq Respublikasının sürətli inkişafının (Çin möcüzəsinin) səbəblərindən biri bu ölkədə bərqərar olan mükəmməl innovasiya sistemidir. Çində bu gün elm yüksək səviyyədə olsa da, onun sənayesində tətbiq edilən innovativ ideyaların 98%-i digər ölkələrdən satın alınır. Bir çox hallarda bu ideyaların daşıyıcıları-konkret alimlər xaricə dəvət olunur (təbii ki, öz ideyaları ilə birgə), bəzi hallarda innovativ informasiya xaricə eksport olunur

(daha çox pirat yollarla), ya da ölkə daxilində səmərəsiz istifadə edilir, öz aktuallığını itirir, çünki innovasiya sistemində vaxt, zaman amili çox mühüm rol oynayır. Rusiya Federasiyasında (RF) innovasiya sistemi daha çox hərbi-sənaye komplekslərində yüksək səmərə ilə işləyir. Bu iki ölkədə olan vəziyyətin müqayisəsi göstərir ki, biliyə əsaslanan iqtisadiyyatın inkişafında səmərəli innovasiya sisteminin təşkili və idarə edilməsi, stimullaşdırılması çox əhəmiyyətlidir. İqtisadiyyatın innovasiya əsasında inkişafı real bazar rəqabətindən bəhrələnməlidir. Ümumiyyətlə, innovasiya siyasəti real bazar iqtisadiyyatlı ölkələrdə səmərə verir, planlı iqtisadiyyat şəraitində innovasiya sistemi inkişaf edə bilmir. Deməli, innovasiya yeni informasiyadan, elmi nailiyyətdən, ixtiradan pul qazanmaqdır, əqli əməyin məhsulunu bazarda sərfəli şəkildə sata bilmək qabiliyyətidir. İnnovasiya intellektual sahibkarların mühüm nüvəsi olub İC-də qlobal miqyasda (İnternet vasitəsi ilə intellektual tutumlu məhsulun elektron ticarəti olaraq) fəaliyyət meydanına çevriləcək. Hansı ölkənin daxili bazarının ayrı-ayrı seqmentlərində inhisar mövcuddursa, onda, təbii ki, inhisar sahibkar innovasiyaya maraqlı deyil, bu sahəyə əlavə investisiya qoymaq istəmir, çünki bazarda rəqabət yoxdur. Qlobal iqtisadi məkanda isə bu siyasətlə heç bir müəssisə xarici bazara çıxa bilməz, çünki istehsal edilən mal elmin son nailiyyətlərindən bəhrələnmədiyi üçün rəqabətə davamlı ola bilməz.

Dinamik inkişaf edən ölkələrin təcrübəsi göstərir ki, iqtisadi tərəqqi aşağıdakı amillərdən asılıdır:

• istehsalın səmərəliliyini artırmaq üçün iqtisadi rəqabət;

• investisiya axınını optimallaşdıran maliyyə sistemi;

• kadrların ixtisasartırmasını stimullaşdıran əmək bazarı;

• şəffaf və səmərəli dövlət idarəetmə sistemi;

• sahibkarlığa münbit şərait yaradan hüquqi sistem;

• əhalinin geniş təbəqələrinin davamlı iqtisadi islahatlara müxtəlif struktur dəyişikliyinə uyğunlaşmasını asanlaşdıran səmərəli sosial müdafiə sistemi.

İC-nin əsası olan biliyə əsaslanan iqtisadiyyatın inkişafı üçün əlavə olaraq aşağıdakı şərtlərin olması zəruridir:

• Mövcud informasiya resurslarından səmərəli istifadəni, yeni resursların yaradılmasını stimullaşdıran iqtisadi və təşkilati imkanların yaradılması;

• Əhalinin təhsil səviyyəsinin yüksəldilməsi, kadrların ixtisasartırma sisteminin inkişafı;

• İnformasiya emalı və ötürülməsi infrastrukturunun dinamik inkişafı;

• Səmərəli milli innovasiya sisteminin yaradılması.

Respublikada innovativ elmi ideyalar və texnologiyalar əsasında, biliyə əsaslanan iqtisadiyyatın yaradılması, inkişafı, bu əsasda yeni iş yerlərinin yaradılması, regionların sürətli sosial-iqtisadi inkişafı, müvafiq sahibkarlıq fəaliyyətinin–innovativ əsaslı biznesin formalaşması zamanın tələbidir. Bu gün bir çox ölkələr öz strateji inkişaf proqramlarında təbii sərvətlərə yox, elmtutumlu fəaliyyətə, insan resurslarının inkişafına diqqət edirlər. İC-də bilik əmtəə dəyərinin əsas mənbəyidir. İnformasiya cəmiyyətinin əmək aləti informasiya, əmək predmeti isə İKT-dir. İctimai inkişaf vüsət aldıqca mənfəətin, gəlirin əsas mənbəyini maddi resurslar deyil, elm, bilik, informasiya resursları (elmi-texniki nailiyyətlər, innovasiyalar, yeni texnologiyalar və s.) təşkil edir. İqtisadi inkişafda biliyin əsas amil olması ictimai həyatın strukturunda təhsilin rolunu əhəmiyyətli dərəcədə gücləndirir, iqtisadiyyatın inkişaf səviyyəsinin bilavasitə

təhsilin səviyyəsindən asılı olduğu nəzərə çarpır. Ən yaxşı investisiya insan amilinə, onun təhsilinə qoyulan investisiyadır. Təhsilə sərf edilmiş vəsait bir neçə qat artıqlaması ilə özünü doğruldur. Son vaxtlar Azərbaycan hökuməti ilə BMT-nin birgə reallaşdırdığı "Qara qızılı insan qızılına çevirək" layihəsi bu mənada təqdirəlayiqdir. İC-də intensiv iqtisadi inkişaf zərurəti, əmək bazarında rəqabətin qlobal xarakter alması insanlardan peşəkarlıq səviyyəsinin fasiləsiz yüksəldilməsini tələb edir. Bu mənada korporativ təhsil sistemi yaranır və inkişaf edir. Müəssisədaxili təlimlərin təşkili müəssisənin rəqabətədavamlılığında və inkişafında mühüm rol oynayır. İC-də iqtisadiyyatla təhsil bir-birindən asılı olub, biri digərinin inkişafına təkan verir. İnformasiya, nəzəri biliklər, təhsil səviyyəsi ölkənin strateji resursu olub, suverenliyi və milli təhlükəsizliyi, nəticə etibarilə ölkənin gələcək inkişafını təmin edir. İC tələbləri baxımından müasir təhsil sistemi kompleks dəyişikliyə məruz qalmalıdır. İC təhsilin ideologiyasını, onun fəlsəfi anlamını, cəmiyyətdəki rolunu köklü sürətdə dəyişdirir. İC-də təhsil tarixin heç bir ictimai formasiyasında olmayan bir səviyyəyə yüksəlir. Belə fundamental dəyişikliklər təkcə təhsil sisteminin öz gücü hesabına reallaşa bilməz, bu məqsədlə xeyli əlavə resurs, cəmiyyətin bütün təbəqələrinin fəal iştirakı lazımdır. Biliyə əsaslanan iqtisadiyyat mükəmməl innovasiya siyasəti və hüquqi bazanın olması ilə yanaşı, güclü insan resursları (yüksək elmi-texniki potensiala, yaradıcı düşüncəyə malik, yeniliyə can atan kadrlar) tələb edir. Bu problemlərin həlli cəmiyyətdə fasiləsiz, keyfiyyətli təhsili zəruri edir. İnkişaf etmiş ökələrdə (ABŞ, ÇXR, Yaponiya və s.) artıq əhalinin icbari təhsil alması məsələsi gündəmdədir. Bu kütləvi ali təhsilin yolu, təbii ki, açıq, virtual, elektron, distant təhsildir. Beynəlxalq aləmdə mütəxəssislər arasında belə yekdil rəy var ki, distant elektron təhsil – innovasiyadır. Hər sahədə innovasiya yeni bir texnologiya ilə özünü göstərir, təhsildə isə bu qlobal dünyanın tələbi olan distant virtual təhsil formasında təzahür edir. Bu səbəbdən biliyə əsaslanan iqtisadiyyat şəraitində təhsilin məzmun və texnologiyaları dəyişikliyə uğramalıdır. İC tələblərinin sürətlə dəyişməsi, dəqiqləşməsi, yeni rakurs alması səbəbindən bir çox ölkələr milli təhsil doktrinalarında həyatın dəyişən tələblərini daim nəzərə almalı olur, təhsil strategiyaları müntəzəm olaraq konkretləşir. Milli innovasiya sisteminin inkişafı, onun kadr təminatı məsələlərini həll etmək məqsədi ilə universitetlər öz tələbələrinə informasiya resurslarından (İnternet, kitabxana, arxiv və s.) səmərəli istifadə üsulları ilə yanaşı, həm də yeni bilikyaratma yollarını öyrətməlidir. Universitetlər tədris və elmi fəaliyyətlərini daha sıx əlaqələndirməli, qabiliyyətli, perspektivli gənclər seçilərək elmi fəaliyyətə cəlb edilməli, xüsusi istedada malik gənclərlə məktəb illərindən başlayaraq planlı iş aparılmalıdır. Bu mənada Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sərəncamı ilə təsdiq edilmiş "Xüsusi istedada malik uşaqların (gənclərin) yaradıcılıq potensialının inkişafı Dövlət Proqramı (2006-2010)" vaxtında qəbul edilmiş mühüm dövlət sənədidir.

Bu amillərin nəzərə alınması elmi kadrların yaradıcı potensialının inkişafına, onların beynəlxalq əlaqələrinin qurulmasına, bu sahəyə qabiliyyətli gənclərin cəlb edilməsinə kömək edə bilər. Nəticədə respublikanın insan potensialı, elmtutumlu sahələr üçün müasir tələblərə cavab verən milli kadrların səviyyəsi daha da yüksələr. İC təhsilin həm məzmununu (ilkin mərhələdə Boloniya konvensiyası tələblərinə, sonrakı mərhələdə qlobal, vahid təhsil məkanı tələblərinə uyğun olaraq), həm də təhsilin

texnologiyalarını (qlobal virtual şəbəkə universitetlərinin yaradılması istiqamətində) təkmilləşdirməyi tələb edir. Elektron cəmiyyətin elektron hökuməti, elektron parlamenti, elektron seçki sistemi, elektron ticarəti, elektron gömrük, vergi və bank sistemi, elektron sənədləşmə sistemi (elektron imza) və s. olduğu kimi, elektron təhsili də olmalıdır (bu məsələnin respublikada kompleks həlli “Elektron Azərbaycan” Dövlət Proqramında mərhələlərlə nəzərdə tutulub). Elektron (virtual, distant) təhsil sisteminin əsas elementi informasiya təhsil məkanıdır. İnformasiya təhsil məkanı – öyrənənlərin təhsil ehtiyaclarının təmin edilməsinə yönəlmiş, verilənlər, informasiya resursları, qarşılıqlı əlaqə protokollarının ötürülmə vasitələri, aparat-proqram, metodik təşkilati təminat və s. vasitələrin sistemli təşkilidir. Elektron təhsil öyrədən və öyrənən arasında əlaqəni telekommunikasiya və kompyuter şəbəkələri vasitəsi ilə operativ, müntəzəm dialoq, əks-əlaqə əsasında, uzaq məsafədən həyata keçirən texnologiyadır. İnformasiya təhsil məkanı vasitəsi ilə reallaşan elektron təhsil sisteminin mühüm elementi elektron təlimdir. Elektron təlim informasiya təhsil fəzasında tələbələrə məkan və zamandan asılı olmayaraq, müasir İKT vasitələrinin tətbiqi ilə öz biliklərini fasiləsiz artırmağa imkan verir. Elektron təlimi formalaşdırmaq, inkişaf etdirmək, keyfiyyətini yüksəltmək üçün onun təminatı məsələləri, xüsusən də kadr təminatı məsələlərinin (vahid informasiya təhsil məkanında səmərəli fəaliyyət göstərən professor-müəllim və köməkçi heyətin formalaşması) operativ həll edilməsi respublikamızın İnformasiya Cəmiyyətinə keçidini təmin edən əsas amillərdən biridir.

*Rəyçi: prof. İ.İsmayılov*

## İstifadə edilmiş ədəbiyyat


**1. Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı. Azərbaycan Təhsil siyasəti (1998-2004). Bakı: Təhsil, 2005.**

**2. “2008-2012-ci illərdə Azərbaycan Respublikasında təhsilin informasiyalaşması” Dövlət Proqramı.**

**3. Алигулиев Р., Алиев А. Экономические особенности информационных технологий. Баку: Елм, 2002.**

**4. Вершинская О. Информационно-коммуникационное технологии и общество. Ин-т соц.-экон. Проблем народо-населения РАН. М.: Наука, 2007, 2003 с.**

**5. Лау Х. Руководство по информационной грамотности для образования на протяжении.**

**6. Ələkbərova İ. İnformasiya müharibəsi texnologiyaları. Bakı, 2012.**

**7. Məmmədov T. Təhsildə informasiya-kommunikasiya texnologiyaları nəzəri əsasları və praktik işlər. Naxçıvan: Əcəmi, 2014.**



**Т.Мамедов**

**Образование в информационном обществе**

**Резюме**

**Статья посвящена развитию образования в информационном обществе.**



**T.Mammadov**

**Education in information society**

**Summary**

**The articel was dedicated to the development of education.**



# TƏLİM NƏTİCƏLƏRİNİN REALLAŞDIRILMASINDA MOTİVASİYANIN ƏHƏMİYYƏTİ



**Səbinə Ağayeva,**
***ADPU-nun dosenti, riyaziyyat üzrə fəlsəfə doktoru***
**Vaqif Süleymanov,**
***Bakı şəhəri, 135 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:* *motivasiya, interaktiv təlim, təlim nəticələri, müasir dərs.***

***Ключевые слова:* *мотивация, интерактивное обучение, результаты обучения, современный урок.***

***Key words:* *motivation, interactive teachinq, learning outcomes, modern lessons*.**

Ölkəmizdə təhsilin keyfiyyətini dünyanın inkişaf etmiş ölkələrinin təhsili səviyyəsinə yüksəltmək məqsədi ilə ümummilli liderimiz Heydər Əliyev qeyd edirdi ki, “biz bu gün də, gələcəkdə də gənclərimizi təhsilə, biliyə cəlb etməliyik, təhsilin keyfiyyətini artırmalıyıq, təhsil sahəsini daha da mükəmməlləşdirməliyik”. Ümummilli liderin ideyaları Respublika Prezidenti İlham Əliyev tərəfindən davamlı olaraq yaradıcılıqla həyata keçirilir. Cənab Prezidentimiz təhsil sahəsinə aid təsdiq etdiyi sənədlərdə bu sahəni prioritet istiqamət elan etmişdir. Bu baxımdan 2013-cü il 24 oktyabr tarixli sərəncamla təsdiq olunan “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda qeyd edilmişdir ki, əsas məqsədlərdən biri “ölkədə insan kapitalının inkişafı, şəxsin müasir bilik və bacarıqlara yiyələnməsinin təmin edilməsidir”. Bu vəzifələri həyata keçirmək üçün ölkəmizdə tətbiq olunan yeni kurikulum islahatı uğurlu nəticələri ilə irəliləməkdədir. Təhsil islahatı hər bir fənn üzrə müəyyən olunmuş təlim nəticələrinin reallaşdırılması üçün təhsilverən və təhsilalanların qarşısında çox böyük vəzifələr qoymuşdur. Bu vəzifələri həyata keçirmək üçün dərslərin fəal (interaktiv) təlim əsasında keçirilməsi önəmli hesab edilir. Müasir fəal (interaktiv) təlim əsasında keçilən dərslər, əsasən, mərhələlər əsasında qurulur və bu mərhələlərdən birincisi motivasiya (problemin qoyulması) adlanır. Müşahidələrdən aydın olur ki, motivasiyanın uğurlu şəkildə yaradılması və həyata keçirilməsi elə də sadə iş deyil və təhsilverənlər bu istiqamətdə müəyyən çətinliklərlə üzləşirlər. Nəzərə alsaq ki, uğurlu motivasiyanın yaradılması və həyata keçirilməsi qarşıya qoyulan məqsədin yarısının yerinə yetirilməsi deməkdir, məhz onda bu işin yüksək təlim nəticələrinin qazanılmasında əhəmiyyəti daha aydın təsəvvür olunar.

Qeyd etmək lazımdır ki, məktəb rəhbərliyi tərəfindən müəllim elə ilk iş günündən motivasiyaya yönəldilməlidir. Yeni müəllimin birinci iş gününün maraqlı

keçməsi onun bu metoda istiqamətləndirilməsi üçün etibarlı zəmindir.

Dünya təhsilində bu sahədə müəyyən təcrübələr vardır. ABŞ-da aparılan tədqiqatların nəticəsi göstərmişdir ki, ilk iş günü və müəllimin ilk iş ilində ona verilən dəstək aşağıdakı müsbət hallara gətirib çıxarır:

- Müəllimlərin məktəbdə qalma göstəricisinin yüksəlməsi;
- Şagirdlərin yüksək göstəricilərinin olması;
- Müəllimlərin keyfiyyətli dərs keçməsi;
- Müəllim heyəti arasında komanda ruhunun yaranması;
- Müəllimlərin tədris metodlarının rəngarəngliyi;
- Sinifi yüksək idarəetmə bacarığı;
- Qeyri-adi halların yaxşı idarə olunması;
- Qocaman müəllimlər üçün özünüdoğrultma imkanı;
- Hər iki tərəf üçün iş məmnunluğu;
- Davranış problemlərinin həlli.

Fəal təlim üsulları əsasında keçilən dərsdə motivasiya təfəkkür prosesini hərəkətə gətirərək öyrənənlərin idrak fəallığına təkan verən proses olduğu üçün dərsin çox vacib hissəsi hesab olunur. Motivasiya mərhələsində təhsilalanların qarşısında problem qoyulur və bu məqsədlə onlara suallar, tapşırıqlar verilir, yönəldici suallar təklif olunur, tədqiqat sualı çıxarılır, fərziyyələr irəli sürülür. Dərsin sonunda bu fərziyyələrin doğru olub-olmamasına qayıdılır və tədqiqatların nəticələri əsasında ümumiləşdirmələr aparılır. Motivasiyada təhsilalanın qarşısında qoyulan sual onlarda idrak fəallığı yaradır, dərsin sonrakı hissəsinin yüksək səviyyədə keçməsinə səbəb olduğu üçün təlimin keyfiyyətinin yüksəldilməsində çox böyük əhəmiyyətə malikdir. Motivasiya hər hansı bir fəaliyyətin mexanizmini işə salan sövqedici qüvvə kimi çıxış edir. Motivasiya yaradılarkən aşağıdakı meyarlara cavab verməsi diqqət mərkəzində saxlanılmalıdır:

1) Motivasiyanın məqsədəuyğunluğunun gözlənilməsi;

2) Motivasiya nəticəsində problem və müxtəlif fərziyyələrin yaranması;

3) Motivasiyanın təhsilalanların yaş və bilik səviyyəsinə uyğunluğu;

4) Motivasiyanın yığcamlığı və qısa vaxt ərzində həyata keçirilməsi.

Motivasiyanın yaradılmasının müxtəlif üsulları vardır. Bunları 3 əsas qrupa ayırmaq olar:

**1. Rəmzi (simvolik) materialın şərhi.**

Rəmzi material olaraq rəsm, fotoşəkil, simvol, musiqi parçası, ədəbi əsərlərdən bir hissə, əşya, rəvayət, tapmaca, qrafik, sxem və s. ola bilər. Təhsilverən rəmzi materialı təqdim edərkən qeyd edir ki, "bu nəyi bildirir və bizim öyrəndiyimiz mövzu ilə hansı əlaqəsi var?". Nəticədə təhsilalanın diqqəti yaradılan problem ətrafında cəmlənir və bu istiqamətdə tədqiqatın aparılmasına yönlənir.

**2. Sual verməyə həvəsləndirmə.**

Təhsilalanın təfəkkürünü fəallaşdıran sualların 3 növü vardır: 1) Öyrənilən mövzu üzrə naməlum olan məsələləri müəyyənləşdirən suallar. Sual vermə zamanı müəllim şagirdlərin təfəkkürünü lazımi səmtə yönəldir. Suallar verilib qurtardıqdan sonra onlardan tədqiqata uyğun olanları seçilir. Burada təhsilverən fasilitasiyaya əsaslanaraq tədqiqat sualını dəqiqləşdirmək üçün təhsilalanları sualı daha dəqiq ifadə etməyə istiqamətləndirməlidir. 2) Açıq suallardan istifadə olunur. 3) Öyrənilən mövzuya aid olan suallar. Bu suallar açar sözlərin köməyi ilə verilir.

**3. Problemin müxtəlif yollarla həll olunması.**

Buraya təhsilverənin məsələni müxtəlif üsullarla həlli imkanının olması barədə fikir

və mülahizələri daxildir. Aşağıda bəzi dərslərin tədrisi zamanı motivasiyanın qurulması nümunələri verilir:

1-ci dərs

**Sinif: VII Riyaziyyat**

Mövzu: Çoxhədli və onun standart şəkli.

Standart: 2.2.1. Çoxhədlilər üzərində toplama, çıxma və vurma əməllərini yerinə yetirir.

Təlim nəticəsi: Çoxhədlini tanıyır və standart şəklə gətirir.

İş forması: Qrup və fərdi iş.

İş üsulu: Beyin həmləsi və müzakirə

Resurslar: Dərslik, iş vərəqləri, İKT avadanlıqları.

**Motivasiya:**

Motivasiya yaratmaq məqsədi ilə qruplara suallar verilir, həmçinin qrupların təhsilverənə suallar verməsi təmin olunur. Suallar aşağıdakı məzmunda ola bilər:

1) Birhədli nəyə deyilir və qeyd olunan ifadələrdən hansı birhədlidir?

2ab; X3; 2x2; x+y; -3,4; -4x+1

2) Birhədlinin standart şəkli nədir?

3) Birhədlinin dərəcəsi və əmsalı necə tapılır?

4) Oxşar birhədlilər və əks birhədlilər nəyə deyilir?

5) Birhədlidə hansı əməllər iştirak edir?

Verilən suallar qruplar tərəfindən cavablandırıldıqdan sonra onlara aşağıdakı suala cavab verməк təklif olunur:

Birhədliləri toplamaq və çıxmaq olarmı və bununla hər hansı məsələnin həllinə nail olmaq mümkündürmü?

**Bir məsələni yadda saxlamaq lazımdır ki, “Ədədləri uşağa izah etmədən əvvəl uşaqda ədədlərə olan ehtiyacı canlandırmaq və həyatda istifadə edə biləcəyi praktiki bir alət olduğunu hiss etdirmək lazımdır” (John Dewey).**

Təhsilalanlar belə sualları cavablandırmaqda acizdirlər. Lakin sualın cavabı onları çox maraqlandırır ki, birhədlilərin cəmini və fərqini necə tapmaq olar? Beləliklə, təhsilalanlar özləri tədqiqat sualını müəyyən edirlər.

Tədqiqat sualı: Birhədliləri necə toplamaq və çıxmaq olar?

2-ci dərs

**Sinif: VII - Riyaziyyat**

Mövzu: Çoxhədlinin vuruqlara ayrılması.

Standart: 2.2.1. Çoxhədlilər üzərində toplama, çıxma və vurma əməllərini yerinə yetirir.

Təlim nəticəsi: Çoxhədlini qruplaşdırma üsulu ilə vuruqlara ayırır və həmin qaydanı müxtəlif çalışmaların həllinə tətbiq edir.

İş forması: Qrupla və kollektiv iş

İş üsulu: Beyin həmləsi və müzakirə

Resurslar: Dərslik, iş vərəqləri, İKT avadanlıqları

**Motivasiya:**

Suallar:

1) Vurmanın qruplaşdırma qanunu necə ifadə olunur?

2) Vurmanın paylama qanunu necə ifadə olunur?

3) Ortaq vuruq mötərizə xaricinə necə çıxarılır?

Qruplar sualları cavablandırdıqdan sonra onlara aşağıdakı suala cavab tapmaq tələb olunur:

Verilən çoxhədlidə vuruqları eyni olan birhədliləri qruplaşdırmaqla çoxhədliləri vuruqlara ayırmaq mümkündürmü? Təhsilalanlarda bu suala cavab tapmaq ehtiyacı yaranır. Buradan da tədqiqat sualı çıxarılır:

Tədqiqat sualı: Qruplaşdırma üsulu ilə çoxhədliləri vuruqlara necə ayırmaq olar?

Sonra qruplar fasilitatorun göstərişləri əsasında tədqiqat aparır, tədqiqatın mübadiləsi və müzakirəsini həyata keçirir, nəticə və ümumiləşdirmə edir, yaradıcı tətbiqetmə, ev tapşırığı və refleksiya mərhələlərini

də yerinə yetirməklə dərsi yekunlaşdırırlar.

3-cü dərs:

**Sinif: V - Riyaziyyat**

Mövzu: Simmetriya

Standart: 3.2.1 Sadə simmetrik müstəvi fiqurları tanıyır.

Təlim nəticəsi: a) simmetriya xəttinə görə fiqurların digər xəttini çəkir. b) simmetriyadan istifadə etməklə naxışlar, bəzəklər çəkir.

İş forması: Qrup və fərdi iş.

İş üsulu: Beyin həmləsi və müzakirə.

Resurslar: Dərslik, iş vərəqləri, İKT avadanlıqları, yarpaq və çobanyastığı çiçəklərinin özü və ya modeli.

Dərsin gedişi

**Motivasiya:**

Motivasiya yaratmaq məqsədilə sinfə səliqəli yarpaq və ya onun modeli, səliqəli çobanyastığı çiçəyinin özü və ya modeli gətirilir, gətirilən əşyaların keçiriləcək “simmetriya” mövzusu ilə nə əlaqəsi olduğu soruşulur. Təhsilalanlar ibtidai siniflərdən aldıqları bilik və bacarıqlara əsasən yarpağın xətti simmetriyaya, çobanyastığı çiçəyinin dönmə simmetriyasına malik olduğunu söyləyirlər.

Əşya və fiqurların xətti və ya dönmə simmetriyasına malik olduğunu necə müəyyən etmək olar? Bu tipli suallar təhsilalanlar qarşısında ali məktəblərdə riyaziyyatın tədrisində də qoyulmalıdır. Onlar hələ ali məktəbdən kurikuluma aid təsəvvürlərə yiyələnməlidirlər.

Təhsilalanlar bu sual haqqında fikir söyləsələr də ona dəqiq cavab verməkdə çətinlik çəkirlər və həmin əşya və fiqurların tədqiqata ehtiyacın olduğunu söyləyirlər. Buradan da tədqiqat sualı çıxarılır:

Tədqiqat sualı: Xətti və dönmə simmetriyası olan fiqurların əsas əlamətləri nədir, xətti simmetriya və dönmə simmetriyası nəyə deyilir?

Uğurlu motivasiya ilə başlanaraq keçilən dərslər təhsilalanların dərsə marağını artırır, onların dərsə aid praktik bacarıqlar qazanmasında mühüm əhəmiyyətə malikdir.

Dərslərdə motivasiya məsələləri ali məktəblərdə riyaziyyat kurslarında da öz yerini tutmalı, təhsilalanların orta məktəb kurikulumuna istiqamətləndirilməsi nəzərə alınmalıdır.

*Rəyçi: prof. A.Adıgözəlov*

## İstifadə edilmiş ədəbiyyat


**1. Ümumtəhsil pilləsinin dövlət standartları (kurikulumları). //Azərbaycan məktəbi, № 6, 2011.**

**2. Ümumi təhsilin fənn standartları (I-XI siniflər). Bakı: Mütərcim, 2012.**

**3. Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri. Bakı, 2014.**

**4. Novruzov Q., Abbasov Ə. Ənənəvi təhsildən “düşüncə və təfəkkür məktəbi”nə doğru. //Azərbaycan məktəbi, №3, 2014.**

**5. Motivasiyanın zəruriliyi.// Azərbaycan məktəbi, 2015, №1.**

**6. Veysova Z. Fəal (interaktiv) təlim. Bakı, 2008.**



**С.Агаева,**
**В.Сулейманов**


**Роль мотивации при реализации результатов учебы**

**Резюме**


**В статье говорится о мотивации и способах создания мотивации, даются примеры из опыта.**



**S.Agayeva,**
**V.Suleymanov**


**The importance of motivation in the implementation learning outcomes**

**Summary**


**In the article it is spoken about motivation and its way of creation, given sample from lesson.**

# BİR TARİXİ-FƏLSƏFİ ARAŞDIRMA: PİFAQOR DOKTRİNASI

**Məhəmməd Əkbərov,**
***Xəzər Universitetinin dissertantı***

***Açar sözlər:* *kurikulum, təhsil fəlsəfəsi, riyaziyyatın tədrisi, Pifaqor doktrinası.***

***Ключевые слова:* *курикулум, философия образования, преподование математики, Доктрина Пифагора.***

***Key words:* *curiculum, educational philosophy, teaching mathematics, the doctrine of Pythagoras.***

Ölkəmizdə aparılan təhsil islahatlarının təşəkkül tapdığı müasir dövrdə fənlərin tədrisi prosesində şagirdlərin fizioloji, psixoloji və sosial bacarıqlarının müntəzəm inkişaf etdirilməsində təhsil fəlsəfəsinin öz yeri vardır. Elmdə qəbul olunmuş bir fikri burada yada salmaq yerinə düşərdi: "Fəlsəfəsiz bir yanaşma, yəhərsiz ata minərək, dəlicə ordan-ora, burdan-bura getməyə oxşayır" (Van Til). Bu prinsiplər ümumtəhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları) sənədinin fəlsəfi və psixoloji əsaslarının təhlil edilməsində də nəzərə alınmışdır.

Təhsil fəlsəfəsinin əsasında belə bir tələb də durur ki, təhsilalana dünyanın həm mənəvi, həm də maddi reallıqlarını tanıdan biliklər verilməlidir. Müasir dövrdə ümumtəhsil fənlərinin, o cümlədən riyaziyyatın tədrisində əsas məqsəd ümumtəlim nəticələrinə uyğun olaraq təhsilalanlara elmi biliklər verməklə yanaşı, onlarda fəlsəfi yanaşmalara münasibəti də müntəzəm inkişaf etdirməkdən ibarətdir. Bu baxımdan hər fənnin inkişaf yoluna nəzər salınmasına diqqət yetirilməlidir.

Dərs prosesində təhsilalan məktəbdə müstəqil olaraq dünyanı tanımalı, öz-özünə görə şərh etməlidir. Tarixin süzgəcindən keçən əsas biliklər isə fərdin təcrübə yolu ilə əldə etdiyi biliklərdən daha önəmlidir.

Burada qeyd etmək yerinə düşər ki, alimlərin fikrincə, insanın süzgəcindən keçən əsas biliklər (sosial miras), təhsil proqramlarının nüvəsini təşkil edən nəzəri dərslər riyaziyyat, təbiət elmləri və xarici dillərdir.

Pifaqor teoreminin öyrədilməsi zamanı da bunlar nəzərə alınmalıdır. Teoremin özünün şərhi də bu istiqamətə yönəldilməlidir.

Məlum olduğu kimi, Pifaqor teoremi VIII sinfin həndəsəsində xatırlanır. Pifaqor teoremi həndəsənin çox mühüm problemlərindən biridir. Bu teorem düzbucaqlı üçbucağın iki tərəfi məlum olduqda üçüncü tərəfi tapmağa imkan verir.

Pifaqordan sonra əsrlər boyu bir çox riyaziyyatçılar bu teoremin müxtəlif cür isbatını vermişlər. İndi Pifaqor teoreminin 100-dən artıq müxtəlif isbatları məlumdur. Məsələn, görkəmli Azərbaycan riyaziyyatçısı N.Tusi özünün Evklid həndəsəsinə həsr olunmuş əsərində bu teoremin 48 müxtəlif isbatını vermişdir.

Sokrata qədərki yunan filosofu kimi tanınan Pifaqor, ola bilsin ki, dünyanın ən böyük filosoflarından biri idi, lakin onun

yazılı mənbələri, demək olar ki, olmadığı üçün bizim Pifaqor təlimi və doktrinası haqqında, eləcə də onun sonrakı inkişafı barədə bilmədiklərimiz çoxdur. Həmçinin Pifaqorun həyatı haqqında eşitdiklərimizin də hamısı, erkən dövrlərdə onun adı ətrafında dolaşan əfsanələr belə tam səhih deyildir. Bəzən o, elm adamı kimi, bəzən isə mifik doktrinalar söyləyən vaiz kimi anılır. Odur ki, bu, bizi xarakterlərin hər birinə ayrılıqda nəzər salmağa sövq edir. Həqiqət isə ondan ibarətdir ki, Pifaqor haqda bu ənənəvi baxışlardan hər hansı birini inkar etməyə ehtiyac yoxdur.

Bir həqiqət danılmazdır ki, Pifaqor fəlsəfə tariximizdə, əsasən, riyaziyyat və rəqəmlər haqqında yarımelmi və mistik simvollar müəllifi kimi və bəzən etik normaların yaradıcısı kimi məşhurlaşmışdır. Pifaqorçuların səma cisimləri haqqında fərziyyələri də maraq doğurur. B.e.ə. III əsrdə fəlsəfi istiqamət kimi pifaqorçuluq aradan çıxsa da, II əsrdən sonra dini-fəlsəfi istiqamətli məktəblərlə birləşərək yenidən fəaliyyət göstərməyə başlamışdır. "Hər şey harmoniya və rəqəmlərdən ibarətdir",- fikri Pifaqor fəlsəfəsinin başlanğıc prinsipidir. Maraqlıdır ki, fəlsəfə sözünü ilk dəfə işlədən Pifaqor özünü də filosof adlandırmışdır. Kainatı kosmos adlandıran ilk şəxs də Pifaqor olmuşdur. Bertran Rassel yazır ki, riyaziyyat deduktiv sübutu əsaslandırma kimi məhz Pifaqordan başlayır. Ümumiyyətlə, filosofiya, kosmos, simvol, simvolika, katet, parabola, hiperbola, ellips, optika, eklertika və s. sözləri də ilk dəfə Pifaqor işlətmişdir.

Qeyd edilməlidir ki, Pifaqorun şərhində riyaziyyat nəhənglərinin birliyi və mistisizm kifayət qədər ümumidir. Əslən Samosdan olan Pifaqor Kratonda (cənubi İtaliyada) əvvəllər dini icma və elmi məktəb olan cəmiyyətin əsasını qoymuşdur. Belə bir təşkilatın varlığı o vaxtlar qısqanclıq və inamsızlığın yaranmasına yol açırdı və odur ki, bu da bir çox mübarizələrin qızışmasına zəmin yaradırdı. Nəhayət, iş o həddə çatdı ki, Pifaqor özü Krotondan Metapontinə qaçmalı oldu və orada da vəfat etdi.

Samoslu Pifaqor qədim dünyanın demək olar ki, bütün ölkələrində olmuşdur. Məsələn, Misirdə 22 il, Babilistanda 12 il yaşamışdır. Onun məktəbində poeziya, tibb, musiqi, elm, xüsusilə ilə də riyaziyyat bir-birini əvəz etmişdir. Səciyyəvi haldır ki, Pifaqor özünü yer üzərində "ilkin və təbiətin kökündən" kosmik səsləri başa düşən yeganə adam hesab edirdi.

Əfsanələrə söykənərək onun həm də təqribən eramızdan əvvəl 580-ci ildə anadan olduğunu söyləmək olar. Onun Anaksimandrın davamçısı olduğu deyilir və Pifaqorun astronomiyası Anaksimandrın astronomiyasının təbii yüksəlişi idi.

Pifaqor həndəsəsinin inkişaf yolu öz başlanğıcını Milet məktəbindən götürmüşdür. O, təsadüfi olmayaraq həndəsədə ilkin anlayışlar kimi 3 məfhumu- nöqtə, xətt və səth əlaqələrini əsas kimi qəbul etmişdir. O zamanın ən böyük problemi - kvadratın çoxaldılması problemi hipotenuzun kvadratı teoreminin meydana çıxmasına təkan verdi və bu da Pifaqorun adı ilə bağlı oldu.

Pifaqor iddia edirdi ki, Olimpiya oyunlarında iştirak edən şəxslər 3 təbəqədən olduğu kimi, həyatda da 3 növ insan mövcuddur. Ən aşağı siniflər alqı-satqı etmək üçün gələnlər, onlardan bir az üst siniflər isə yarışmağa gələnlər idi. Ən üst (ali) səviyyədə olanlar isə sadəcə izləməyə gələn seyrçilər idi. O iddia edirdi ki, insanlar ağıl, şərəf, mənfəət sevənlər kimi də qruplaşdırıla bilər. Bununla da erkən pifaqorçulara aid olan üçtərəfli ruh doktrinası barədə fikirlər tədricən intişar tapmağa başlayırdı.

Pifaqor, həmçinin çağdaş Orfikdən öyrəndiyimiz transmiqrasiya və ya dirçəliş haqqında təlimləri də keçirdi. Daha maraqlı bir məqamı da qeyd etmək lazımdır ki,

özündən on və ya iyirmi nəsil əvvəl yaşamış adam haqqında danışanda, Empodokl da Pifaqora istinad edirdi. Bu, Platonda dərin təəssürat yaratmış və bunlar onun xatirələr doktrinasında öz əksini tapmışdı. Platon göstərirdi ki, hislərimizlə qavradıqlarımız ruh bədəndən çıxanda bildiklərimizi və gerçəkliyi birbaşa qavramağımızı bizə xatırladır.

Daha bir maraqlı məqamı qeyd etmək yerinə düşərdi ki, Pifaqorun kosmologiyası ilə bağlı daha çox problemlər mövcud olmuşdur. Pifaqorçular qədər öz təsisçisinin nüfuzuna bu qədər hörmət bəsləyən bir məktəb çətin ki tapılsın. "Ustad belə dedi" onların şüarı idi. Digər tərəfdən isə çox az məktəb yeni şərtlərə uyğunlaşaraq bu cür inkişaf potensialı göstərmişdir. Pifaqor Anaksimenin kosmik sistemindən başlamışdır. Təsadüfi deyildir ki, Aristotel bildirirdi ki, Pifaqor dünyanı kənardan "hüdudsuz kütləvi tənəffüs forması" kimi göstərirdi və bu "hava" (air) "qeyri-məhdud" (the unlimited) kimi müəyyən edilirdi. Onun təliminə görə hadisələr "sərhədsiz" (the unlimited) şəkildən sərhədlərini aşıb inkişaf edərkən, böyük dəyişiklik müşahidə edirik; biz sadəcə olaraq reyrfaksiya və kondensasiyadan başqa heç bir "xaric olunma" hiss etmirik. Belə ki, onun əvəzinə sərhədləri olmayan qeyri-məhdud ölçüdə bu proseslərə rəvac verən "limit nəzəriyyəmiz" vardır. Bu, Pifaqorun fəlsəfəyə böyük töhfəsidir və biz bunu anlamağa çalışmalıyıq. Qəribə olsa da, çərçivəsi məhdud olanın funksiyası məhz musiqi və tibb sənətlərində göstərilir və bunların pifaqorçular üçün nə qədər önəmli olduğunun şahidi oluruq. Odur ki, onların hansı mənanı kəsb etməsini bilmək təbiidir. Məlumdur ki, Pifaqor musiqili qammaların uyğun intervallarını müəyyənləşdirən ədədi nisbəti ixtira etmişdir. Musiqili intervallarına bənzər tibbdə də isti və soyuq, yaş və quru kimi əks qütblər mövcuddur və insan bədənində bunların müvafiq "qatışığını" istehsal etmək həkimin işidir. Platonun Fedon dialoqunun məşhur bölümündə Simmi bizə deyir ki, pifaqorçular gövdəni və əsası soyuqda və istidə, nəmdə və quruda simli musiqi alətinin müəyyən avazında yüksəkdə tutmuşdular.

Musiqi ayarı və sağlamlıq "Hüduddan Qeyri-Hüdud formasına yüksəlir". Pifaqor üçün dünyada eyninövlü şeyləri təhlil etmək təbii hal idi. Qısası, Pifaqor doktrinası bütünlükdə rəqəmlər haqqında idi. Bəzi hallarda erkən Pifaqorçular rəqəmləri nümayiş etdirir, müəyyən rəqəmlərdə və şəkillərdə düzülmüş nöqtələrin mənaları ilə onların xassələrini izah edirdilər.

Pifaqor fəlsəfə tarixində əsasən riyaziyyat və rəqəmlər haqqında yarımelmi və mistik simvollar müəllifi kimi və bəzi etik normaların və ən çox isə metempsixoz nəzəriyyəsinin (ruhun bir canlıdan digər canlıya keçməsi) yaradıcısı kimi tanınır.

Pifaqorçuluqda rəqəmlərin mistikası və musiqidə kəmiyyət münasibətlərinin konstruksiyalaşdırılması, astroloji – musiqi quruluşları dəqiq astronomik hesablamalarla özünəməxsus şəkildə uzlaşır. F.Engels bu barədə yazırdı: "Rəqəm müəyyən qanunlara tabe olduğu kimi, bütün kainat da onlara tabedir; bununla da ilk dəfə kainatın qanunauyğunluğu haqqında fikir söyləyir".

Pifaqor öz qarşısına həqiqətən ilahi bir məsələ – kainatın quruluşunun əsas prinsipini (arxe) üzə çıxarmaq məsələsini qoymuşdur ki, bu da ibtidai, formasız xaosu nizamlanmış, məqsədəuyğun kosmosa çevirir. Belə bir prinsiplə bir–birinə zidd element və tendensiyaların rəqəm harmoniyasını qəbul etmişdir. Pifaqorçular harmoniyanı "müxtəlif qarışıqların birləşməsi və müxtəlif fikirliyin razılığı" kimi başa düşürdülər.

Buradan belə bir qənaətə də gəlmək olur ki, pedaqoqlar, həmçinin yaradıcı

müəllimlər hər bir elmi kəşf, o cümlədən yenilik və ətraf aləmdə baş verən dəyişikliklərə uyğun olaraq təhsil siyasətlərini və metodlarını yeniləməyə səy göstərməli və buna hazır olmalıdırlar.

Beləliklə, nəticədə Pifaqor Doktrinasından danışan müəllim onun haqqında dərslikdə olmayan bu məlumatları verməklə, şagirdlərdə bu böyük filosof-riyaziyyatçının şəxsiyyəti haqqında da aydın təsəvvür yaratmış olur.

*Rəyçi: prof. H.Orucov*

## İstifadə edilmiş ədəbiyyat


**1. Don Allen: Pifaqor və pifaqorçular. CST, 1997 (İngilis dilində), 18 s. http://grani.roerich.com/academy/pythagor.htm**

**2. Con Burnet və onun qeydləri: Erkən yunan fəlsəfəsi, 2-ci nəşr, London, 1920, 10 fəsil, 183 s. (İngilis dilində) http://www.classicpersuasion.org/pw/burnet/egp.htm?chapter=4#96.**

**3. Новая философская энциклопедия: В 4 тт. М.: Мысль. Под редакцией В. С. Стёпина. 2001(Rus dilində).**

**4. Самин Д.К.: Сто великих ученых, Москва: «Вече», 2001 (Rus dilində), 591 с.**

**5. Uşaqlar üçün ensiklopediya. Riyaziyyat. Bakı: Şərq-Qərb, 2008.**

**6. Əsədov A. Fəlsəfə tarixindən etüdlər. Bakı, 2007.**

**7. Mirzəcanzadə A. İxtisasa giriş. Bakı, 1990.**

**8. Адамар Ж. Исследование психологии процесса изобретения в области математики. Москва, 1970.**

**9. Кузнецов Б. Современная наука и философия. Москва: Политздат, 1981.**



**М.Акберов**

**Об одном историко-философическом исследовании: Доктрина Пифагора**

**Резюме**

**В этой статье автор пытается философски проанализировать доктрину Пифагора, в которой говорится о том, что философия Пифагора и его школа оказали влияние на основы математики и физики, даже несмотря на дисциплину, Западную традицию гуманитарного образования. Школа Пифагора сочетала в себе как религию, так и математику. Философия Пифагора была источником вдохновения для Платона и Аристотеля, чьи влияния, несомненно, неизмеримы.**

**Далее, статья исследует основы геометрии Пифагора, Космологию и Мистику.**

**M.Akbarov**

**Historical and philosophical research: Pythagoras Doctrine**

**Resume**

**The article makes an attempt to philosophically make some analyses of Pythagorean doctrine. It states that the philosophy of Pythagoras and his school has impacted the very fiber of mathematics and physics, even the western tradition of liberal education no matter what the discipline. The school of Pythagoras was every bit as much a religion as a school of mathematics. Pythagorean philosophy was the prime source of inspiration for Plato and Aristotle; the influence of these philosophers is without question and is immeasurable.**

**The article further investigates the basics of Pythagorean geometry, cosmology and mysticism.**



***Fənlərin tədrisi metodikası, kurikulum***

# QİYMƏTLƏNDİRMƏ ZƏRURİ BİR PROSESDİR

**Günay Hüseynzadə,**
***ARTPİ-nin Monitorinq və qiymətləndirmə şöbəsinin elmi işçisi***

***Açar sözlər:*** ***qiymətləndirmə, dil bacarıqları, dil komponentləri, diaqnostik, formativ, summativ.***

***Ключевые слова:*** ***оценивание, языковые навыки, компоненты языка, диагностическое, формативное, суммативное.***

***Key words:*** ***assessment, language skills, language components, diagnostic, formative, summative.***

Dünyada gedən hazırkı qloballaşma prosesinin və inteqrasiyanın getdikcə sürətləndiyi bir dövrdə yeni informasiya texnologiyalarından istifadə etməklə şagirdlərin kommunikativ bacarıqlarının yüksək səviyyədə inkişafı tələb olunur. Bu səbəbdən Milli Kurikulumda ümumtəhsil məktəbləri üçün müəyyən edilmiş fənlər sırasında xarici dil fənni özünəməxsus yer tutur. Çünki xarici dilin məktəbdə tədrisi sonrakı illərdə digər xarici dillərin öyrənilməsi üçün zəmin yaradır. Xarici dil şagirdlərin linqvistik biliklərini artırır, ünsiyyət mədəniyyətinin formalaşmasında mühüm rol oynayır və nitq inkişafına müsbət təsir göstərir. Xarici dilin tədrisi vasitəsilə ümumi orta təhsil səviyyəsində şifahi nitqin inkişafı əsas tələb kimi götürülməklə şagirdləri ünsiyyət bacarıqlarının formalaşdırılması, lüğət ehtiyatının zənginləşdirilməsi, ən zəruri qrammatik anlayışların və dil konstruksiyalarının mənimsənilməsi və dinləyib-anlama vərdişlərinin inkişaf etdirilməsi təmin olunur.

Xarici dil təlimində qiymətləndirmə prosesi şagirdlərə dilin öyrənilməsi zamanı kommunikativ bacarıqlara yiyələnmələrinə yardımçı olur. Müəllim qiymətləndirmə vasitəsilə şagirdlərin irəliləyişləri üzrə əldə olunan nəticələrinə əsasən təlimin nə dərəcədə səmərəli olması haqqında hesabat və ya rəy verir.

Qiymətləndirmə təlim nəticələrini, standartlarını mənimsəmək, şagirdlərin təlimə marağını yüksəltmək, şagirdin nəyə nail olduğunu bilmək üçün zəruri bir prosesdir. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 13 yanvar 2009-cu il tarixli, 9 nömrəli qərarı ilə təsdiq olunmuş "Azərbaycan Respublikasında ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası" çərçivə sənədində ümumtəhsil məktəblərində şagird nailiyyətlərinin qiymətləndirilməsi üçün aşağıdakı qiymətləndirmə növlərindən istifadə olunur (1):

1. İlkin səviyyənin qiymətləndirilməsi (diaqnostik qiymətləndirmə) şagirdin artıq nələri bildiyini müəyyən edir və təlimin düzgün qurulmasında müəllimə köməklik göstərir. Təlim prosesində düzgün istiqamətləndirilmiş şagird öyrənilmiş materialın təkrarına vaxt itirmir, həmçinin onun başa düşmədiyi material qalmır.

2. Şagird irəliləyişlərinin monitorinqi (formativ qiymətləndirmə) vasitəsilə

tədrisin düzgün istiqamətləndirilməsi həyata keçirilir. Qəbul edilmiş standartların reallaşmasına yönələn irəliləyişlərin monitorinqi (formativ qiymətləndirmə) sinifdə hər bir şagirdin inkişafının hərəkətverici amilinə, təlimin həlledici komponentinə çevrilir. Müəllim yalnız belə monitorinq vasitəsilə tədris prosesini tənzimləyir, bütün şagirdlərin irəliləyişlərini təmin edir, eyni zamanda uğur qazana bilməyən şagirdlərin ehtiyaclarını öyrənərək onlara əlavə köməklik göstərir.

3. Yekun (summativ) qiymətləndirmə şagirdlərin standart və ya standartlar qrupunda müəyyən olunmuş məqsədlərə hansı səviyyədə nail olduqlarını müəyyən edir. Yekun (summativ) qiymətləndirmə standartların mənimsənilməsi istiqamətində şagirdlərin əldə etdiyi irəliləyişləri dəyərləndirir. Bu qiymətləndirmə növü mövzunun, bəhs və bölmənin, yaxud da tədris ilinin sonunda eyni qaydada həyata keçirilir.

Xarici dilin tədrisində dil bacarıqları və dilin komponentləri qiymətləndirilir. Dil bacarıqlarına dinləyib-anlama (listening), danışma (speaking), oxu (reading), yazı (writing); dil komponentlərinə qrammatika (grammar), lüğət (vocabulary), tələffüz (pronunciation), orfoqrafiya (spelling) daxildir. Dilin komponentləri dörd məzmun xətti çərçivəsində inteqrativ şəkildə tədris olunur və reseptiv, produktiv və digər bacarıqları özündə formalaşdırır.

Şagid nailiyyətlərinin qiymətləndirilməsində testləşmə mühüm rol oynayır. Burada bilik və bacarıqlar müxtəlif test nümunələri vasitəsilə yoxlanılır. Bu kağız üzərində yazılı və bəzən kompyuter vasitəsilə də aparıla bilər. Xarici dilin tədrisində müəllim bir sıra test növlərindən istifadə edə bilər.

Diaqnostik test (Diagnostic tests) vasitəsilə şagirdin mövzu ətrafında ilkin bilikləri təyin edilir. Şagirdin maraq və ehtiyaclarını müəyyənləşdirmək üçün məlumatları aydınlaşdırmaq (Eliciting information) ən yaxşı vasitələrdən biridir. Diaqnostik qiymətləndirmədə müəllimə şagirdin bilik və bacarıqlarını yoxlamaq üçün müsahibə, sual-cavab, təqdimat kimi vasitələr yardımçı olur. Diaqnostik test hazırlayarkən müəllim mövzuya uyğun şəkilli test və obyektlərdən istifadə etməlidir ki, mövzu asan başa düşülsün və şagirdlər yeni mövzunun nədən bəhs edəcəyini qabaqcadan bilsinlər.

Formativ test (Formative tests) şagirdin ingilis dilində hər bir təlim prosesində irəliləyişlərini izləmək və zəif-üstün cəhətlərini aydın şəkildə göstərmək üçün istifadə olunur. Sinifdən-sinfə keçdikcə müəllim tapşırıqların növünü artıra bilər.

Aparılmış araşdırmalar nəticəsində məlum olur ki, xarici dil fənnindən şagirdlərin dil bacarıqlarını qiymətləndirmək üçün müxtəlif tipli tapşırıqlar mövcuddur:

– dinləyərək boşluqların doldurulması ( fill in gaps);

– açıq suallara cavab (answer the questions);

– birbaşa cavab ( quick response);

– qısa cavablı suallar (Yes-No questions);

– müxtəlif seçimli cavablı testlər (multiple choice tests);

– mətn üzrə yeni sözlərin seçilməsi (choosing the new words);

- mətnlərin tamamlanması (completing the texts);

– söz sırasının düzgün qurulması (correct word order);

- dialoqun tamamlanması (dialogue completeion);

– rollu oyun tapşırıqları (role play tests);

– şifahi müsahibələr (oral interviews);

– problem vərəqlər üzrə müzakirələr (discussion on problem pages);

– şəkilli mətnlərin oxunması, şəkil

*5

üzrə söhbət (picture-guied tests);

– ucadan oxu və ya sakit oxu (aloud or silent reading);

– mətn üzrə suallar və cavablar (WH-questions on a text);

– səhv-düz cavablar (True-False answers);

- şəkil üzrə yazılar (writings on the picture);

- məktub yazılar, elanlar (writing letters, anouncements);

- esse yazılar (essay writing).

V-VII siniflərdə kiçikhəcmli və VIII-IX siniflər üzrə isə genişhəcmli rubriklərə əsasən qiymətləndirmə cədvəlləri, holistik sorğu vərəqləri, özünüqiymətləndirmə vərəqləri hazırlanır. Bu kimi tapşırıq və testlər şagirdlər tərəfindən yerinə yetirildikdən sonra şagird portfoliosuna yığılır. Müəllim isə qeyd kitabında öz müşahidələrinə və şagird portfoliosunda şagirdlərin cavablarına uyğun qiymətləndirmə rubriklərinə əsasən qiymətləndirmə aparır. Şagirdlərin buraxdığı səhvlər və müəllimin bu səhvlər üzrə verdiyi məsləhətlər kiçik bir qiymətləndirmə vərəqində və ya şagirdin öz vərəqinin son sətrində qeyd olunur.

Müəllim summativ testi (Summative or achievement tests) müxtəlif seçimli cavablar üzrə final imtahanları və şagird təqdimatları, nümayişləri əsasında aparır. Dinləyib-anlamanın qiymətləndirilməsi CD, audio-video vasitəsilə, danışma fəaliyyəti isə müsahibələr və istənilən kontekst üzrə söhbət, təqdimatlar, nümayişlər əsasında aparılır. Oxu və yazının summativ qiymətləndirilməsi kağız üzərində mətn üzrə verilmiş test və tapşırıqlar, esse yazılar əsasında aparılır.

Alternativ qiymətləndirmə (Alternative Assessment) də qiymətləndirmə üçün daha çox əhəmiyyətlidir. Buraya daxildir:

- jurnal yazılar (journal writings);
- təqdimatlar (presentations);
- konfranslar (conferences);
- layihələr (projects).

Xarici dil məzmun standartları xarici dilin kommunikativ cəhətdən bütün tələblərini yerinə yetirir. Hər bir məzmun standartının qiymətləndirilə bilən komponentləri vardır. Müəllim qiymətləndirmə standartlarını bu komponentlər əsasında yazılmış qiymətləndirmə səviyyələri ilə ölçməlidir.

Şagirdin dinləyib-anlama məzmun xətti üzrə standartlarının hansı səviyyədə mənimsədiyinin müəyyən edilməsi üçün aşağıdakı istiqamətlərdə qiymətləndirilməsi zəruridir:

- qrammatik və leksik cəhətdən söz və ifadələrin tanınması;
- yeni söz və ifadələrin seçilməsi və tələffüz edilməsi;
- orfoqrafik qaydalara əməl olunması;
- əsas ideyanın təyin edilməsi və yeni məlumatın qeyd olunması.

Xarici dilə yiyələnməkdə kommunikativ vərdişlərin qiymətləndirilməsi vacib şərtlərdəndir. Danışma tapşırıqları bu vərdişlərin əldə olunmasında böyük rol oynayır. Danışmanı qiymətləndirmək şagirdlərin tənqidi təfəkkürünün inkişafına müsbət təsir edir. Müəllim şagirdlərin şifahi nitq bacarıqlarını qiymətləndirərkən bu tapşırıq nümunələrindən istifadə edir:

- dialoqun tamamlanması (dialogue completion);
- birbaşa cavab (direct response);
- şəkil üzrə söhbət (picture-cued tasks);
- şifahi müsahibələr (oral interviews);
- problem vərəqlər (problem pages);
- rollu oyun tapşırıqları (role-play tests).

Bu tapşırıqlar əsasında məzmun (content), axıcılıq (fluency), lüğət (vocabulary), tələffüz (pronunciation) qiymətlən-

dirilir.

Oxu bacarıqları dilə yiyələnməyin mühüm amillərindəndir. Oxu bacarığı yaxşı olan şagird güclü düşüncə qabiliyyətinə malik olur. Oxuda müxtəlif taksonomik bacarıqları qiymətləndirmək üçün müəllim bu komponentləri əsas götürür:

- müəyyən etmək (identifying);
- tanımaq (recognizing);
- təhlil etmək (analyzing);
- sintez etmək (synthesizing).

Şagirdlər yazı vasitəsilə qrammatik birləşmələrdən istifadə edərək eşitdiklərini düzgün yazır, öz fikirlərini daha geniş ifadə edirlər. Yazı bacarıqlarını qiymətləndirərkən müəllim bir sıra yazı komponentlərini nəzərə almalıdır:

- yazının təşkili;
- söz seçimi;
- söz sırası;
- məntiqi ardıcıllıq;
- durğu işarələri;
- ilkin qaralama.

Şagirdlər esse yazı (essays), jurnal yazılar (journals), məktublar (letters), ərizə formaları (application forms) və s. nümunələrdən istifadə edərək kommunikativ yazı bacarıqlarını inkişaf etdirə bilərlər.

Qiymətləndirmə üçün müəllim çoxcavablı testlərdən (multiple-choice tests), uzlaşmalardan (matching), fonetik simvollardan (converting phonetic symbols), imla (dictation) tapşırıqlarından istifadə edə bilər.

Müəllim siniflər üzrə qiymətləndirmə testlərini seçərkən səviyyəni və həcmi nəzərə almalıdır. Tərtib edilən testlərin interaktivliyi təmin edən, maraqlı və motivasiyaedici olması daha məqsədəuyğundur. Test və tapşırıqlar dinləyib-anlama, danışma, oxu və yazını əhatə etməlidir. Bütün bu fəaliyyət növləri bir-birini tamamlamalı və inteqrativliyə gətirib çıxarmalıdır. Təqdim olunan test və tapşırıqlar şagirdin mövzunu nə dərəcədə mənimsədiyini üzə çıxarır və müvafiq vərdişlərin yaranmasına xidmət edir.

*Rəyçi: dos. İ.Cavadov*

## İstifadə edilmiş ədəbiyyat


1. Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası. //Kurikulum, 2009, № 2.
2. Ümumtəhsil məktəblərində məktəbdaxili qiymətləndirmənin aparılması Qaydaları. //Kurikulum, 2009, № 4.
3. Bağırova N. "Xarici dil kurikulumu və onun xarakterik cəhətləri". "Azərbaycan müəllimi" qəzeti, 28 oktyabr, 2011.
4. Bağırova N. "İngilis dili dərslərində məktəbdaxili qiymətləndirmə". //Kurikulum, 2012, № 1.
5. Cavadov İ. "Şagirdlərin təlim nəticələrinin qiymətləndirilməsinə dair". //Kurikulum, 2012, № 2.
6. Ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumları.//İ.İsgəndərovun redaktəsi ilə. Bakı: Təhsil, 2008, 480 s.


**Г.Гусейнзаде**

**Процесс оценивания является необходимым**

**Резюме**

**В статье раскрываются особенности, теоретические основы, содержание и сущность оценивания достижений учащихся по английскому языку.**

**G.Hüseynzadə**

**Assessment is a necessary process**

**Summary**

**In article is reported the intraschool assessment features, theoretical basis, its essence and content in the assessment of pupil's achievement on Azerbaijan language education.**



# ƏMƏK HAZIRLIĞININ İNTEQRATİV MƏSƏLƏLƏRİ

**Şahrza Ağayev,**
***Azərbaycan Müəllimlər İnstitutunun dosenti, pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** ***pedaqoji proses, strategiya, pedaqoji texnologiya, əmək hazırlığı, standart, əməliyyatlar, didaktika.***

***Ключевые слова:*** ***педагогический процесс, стратегия, педагогическая технология, трудовая подготовка, стандарт, операции, дидактика.***

***Key words:*** ***teaching process, strategy, pedagogical technology, labor preparation, standard, operations, didactics.***

Əmək hazırlığı şagirdlərin həyati bacarıqlarının aşılanmasını təmin edir. Bu məqsədlə texnologiyadan şagirdlərin qazanmış olduqları nəzəri biliyin məzmun xətlərinin müəyyənləşdirilməsində bir sıra amillərin rolu vardır.

Təhsil sistemində əmək hazırlığı anlayışının mahiyyəti uzun illər tədris olunan bir fənn kimi xarakterizə olunmuşdur. Əmək hazırlığı ümumtəhsil məktəblərində və müvafiq ali təhsil ocaqlarında şagirdlərə (tələbələrə) texnika, xidmət, kənd təsərrüfatı və s. əmək sahələrinə dair bilik, bacarıq və vərdişlər aşılamağı nəzərdə tutan fəndir. Ümumtəhsil məktəblərində əmək hazırlığı peşə vermək məqsədi daşımır; o, şagirdləri müxtəlif peşələrlə, bu peşələrin insana verdiyi tələblərlə və s. tanış edir; peşəqabağı ümumi hazırlıq verir.

İbtidai siniflərdə şagirdlərin əmək hazırlığının pedaqoji tələblər baxımından həllində fənlərin inteqrasiyasından təlim vasitəsi kimi istifadə son dərəcə effektlidir. Ümumi təhsildə kurikulumun tətbiqi fənlərdaxili və fənlərarası inteqrasiyanın standartlar əsasında dəqiq aparılmasını reallaşdırır. İbtidai siniflərdə şagirdlərin əmək hazırlığının nəzəri və praktik problemlərin həllində ana dili ilə texnologiyanın inteqrasiyası fənlərinin məzmununun mənimsənilməsini optimallaşdırır, məntiqi, yaradıcı və tənqidi təfəkkürün formalaşmasında didaktik imkanları artırır.

Pedaqoji proses şagird əməyinin tədris olunan fənlər üzrə məcmusunu təşkil edir. Tədqiqatın obyekti I-IV siniflərdə əmək hazırlığı prosesi olub, tədris olunan bütün fənlərin təsir imkanları inkar edilmir. Predmet baxımından “Ana dili” və “Texnologiya” fənlərinin təlimdə şagird əməyinin nəzəri bilik və praktik bacarıqların qazanılması işinin pedaqoji əsasları tədqiq olunur. Burada əsas diqqət fənlərin məzmununa istinad edərək şagird əməyinin yeni pedaqoji texnologiyaların tətbiqi ilə müasir dövrün sosial-iqtisadi inkişafına uyğun rəqabətə cavab verən şəxsiyyətlərin yetişdirilməsinə nail olmaqdır.

Pedaqoji prosesdə tədris olunan hər bir fənnin məqsədi, vəzifələri, məzmunu,

metodları iştirakçıların (öyrədən və öyrənən) qarşılıqlı təsir formaları sayəsində qazanılan nəticələr öz həllini tapır. Bu cəhətdən ibtidai siniflərdə tədris olunan "Texnologiya" fənninin digər fənlərlə əlaqəli tədrisinin şagird şəxsiyyətinin formalaşmasında mühüm əhəmiyyəti vardır. Çünki bu fənnin məqsədi yeni sosial iqtisadi şəraitdə şagirdlərin müstəqil həyata, kütləvi və perspektivli peşələrə hazırlanmalarına, ümuməmək bacarıq və vərdişlərinə yiyələnmələrini, yaradıcı düşüncə və aktiv fəaliyyət əsasında müxtəlif şəraitlərə asanlıqla uyğunlaşmalarını reallaşdırır.

İbtidai siniflərdə tədris olunan fənlərin (Azərbaycan dili, xarici dil, riyaziyyat, informatika, həyat bilgisi, texnologiya, fiziki tərbiyə, təsviri incəsənət, musiqi) hər biri pedaqoji prosesin məzmununa daxildir. Bu prosesdə pedaqoji əmək təlim strategiyaları (təlim prosesi və onun təşkili prinsipləri, fənn üzrə təlimin planlaşdırılması, təlimin təşkilində istifadə olunan forma və üsullar) vasitəsilə həyata keçirilərək, təşkilolunma səviyyəsinə, texnologiyasına, qənaətcilliyinə, məhsuldarlığına görə xarakterizə olunur.

İbtidai təhsil pilləsində tədris olunan hər bir fənnin əhəmiyyəti, məqsəd və vəzifələri pedaqoji prosesdə əmək şəraitində həllini tapır. Əmək prosesi nəzəri və praktik cəhətdən şagirdlərin hazırlıq səviyyəsi ilə şərtlənir.

Azərbaycan Respublikasında ümumi təhsilin Milli Kurikulumu çərçivə sənədində ibtidai təhsil pilləsində "Ana dili" və "Texnologiya" fənlərinin tədrisi zamanı pedaqoji əmək vasitəsilə aşağıdakı mənəvi keyfiyyətlər qazanılır:

"Azərbaycan dili": Əlifbanın öyrənilməsi. Oxu və yazı texnikasının, hüsnxətt qaydalarının, düzgün, sürətli, şüurlu və ifadəli oxu üzrə ilkin bacarıqların mənimsənilməsi, lüğət ehtiyatının tədricən zənginləşdirilməsi, ən zəruri qrammatik qaydaların və ədəbi tələffüz normalarının öyrənilib tətbiq olunması, ekspressiv nitq bacarıqlarının formalaşdırılması, Azərbaycan xalqının dili, tarixi, əxlaqi-mənəvi keyfiyyətləri, mədəniyyəti, adət-ənənələri haqqında ilkin anlayışların yaradılması təmin olunur.

"Texnologiya": Şagirdlərdə müqayisə və çeşidləmə, ilkin emal, özünəxidmət və birgə fəaliyyət vərdişləri, sadə layihələndirmə, tərtibat, modelləşdirmə, dizayn, canlı təbiətə xidmət bacarıqları, ölçü, mütənasiblik, simmetriya və digər həndəsi anlayışlar formalaşdırılır, sadə konstruksiyalar və yaradıcı işlərin yerinə yetirilməsi üzrə qabiliyyətlərin aşılanması təmin olunur.

"Azərbaycan dili" və "Texnologiya" fənlərinin vəzifələrini təsbit edən məzmun və məqsəd şagird əməyi ilə nəticələnir. Hər iki fənnin tədrisi şagirdlərdə texnoloji biliyin və bacarığın formalaşmasını tələb edir. Bu baxımdan pedaqoji prosesin mərhələləri və eləcə də tədris məqsədlərinin səviyyəsi (Blumun taksonomiyası) bilik, anlama, tətbiqetmə, təhlil, tərkib, qiymətləndirməni əks etdirən konkret fəaliyyət (əmək) sistemli xarakter almalıdır.

İbtidai siniflərdə pedaqoji prosesdə şagirdlərin əmək hazırlığının fənlərin inteqrasiyasına əsasən aparılması nəzəri və praktik cəhətdən dərketməni təmin edir.

Təcrübə göstərir ki, ibtidai siniflərdə şagirdlərin əmək hazırlığının nəzəri və praktik istiqamətlər üzrə formalaşması onların intellektuallığını inkişaf etdirir və yuxarı siniflərdə bu tendensiya dinamik səciyyə daşıyır.

İbtidai siniflərdə şagirdlərin əmək hazırlığının formalaşmasında didaktikanın əsas vəzifəsi olan təlim prosesinin reallaşması şəraitini təsvir, izah etmək və onun ən mükəmməl təşkilinin yeni texnologiyasının işləyib hazırlanması zərurəti vardır. Çünki nəzəriyyə öz-özlüyündə məqsəd deyildir. O, praktiki fəaliyyətin əsasıdır, ona istiqa-

mətləndirmə, kökündən dəyişdirmə imkanı verir.

Bu baxımdan şagirdlərin əmək hazırlığının nəzəri və praktik məsələləri standartlarla tənzimlənməlidir. Dövlət tələbi olan standartlarda qazanılan zəruri bilik məqsədyönlü fəaliyyətdə həllini tapır. Məsələn:

I sinif. Azərbaycan dili.

1.1. Dinlədiyi fikri anladığını nümayiş etdirir.

Texnologiya: 1.1. Sadə emal texnologiyalarını və vasitələrini tanıdığını nümayiş etdirir.

Qeyd olunan standartlardan bir daha aydın olur ki, ibtidai siniflərdə tədris olunan hər bir fənnin şagirdlərin əmək hazırlığının formalaşmasında nəzəri və praktik cəhətdən imkanları vardır. Demək, əmək hazırlığı didaktik baxımdan bir sistem halında həyata keçirilərək alqoritmik xarakter almalıdır.

İnsanın əmək qabiliyyəti, enerjisi onun tərbiyəsi ilə sıx bağlıdır. Bu mənada təlim əməyi prosesində öyrənənin istifadə etdiyi maddi (fiziki əmək) və qeyri-maddi (əqli əmək) qüvvə onun məqsədyönlü fəaliyyətini təmin edir (3, səh. 53).

Mövzu ilə əlaqədar aşağıdakı nəticələri söyləmək olar:

• Qloballaşan dünyada şagirdlərin kiçik yaşlarından başlayaraq pedaqoji prosesdə tədris olunan fənlərin nəzəri və praktik əsasları üzrə əməyə alışdırmaq onların vaxtında həyata düzgün hazırlığını təmin edir.

• Pedaqoji proses şagirdlərin hər bir fənn üzrə öyrənməni, təhsillənməni, tərbiyələnməni və hərtərəfli inkişafını həyata keçirən əmək hazırlığının sistemli həllini reallaşdıran dinamik səciyyə daşıyır.

• Şagirdlərin yeni sosial-iqtisadi şəraitdə XXI əsrdə insanlara vacib olan bilik, bacarıq, vərdiş və keyfiyyətləri pedaqoji əməkdə qazanılır. Burada bütün imkanları əlaqələndirilir.

• Pedaqoji texnologiya təhsilin bütün sahələrinə nüfuz edərək ilkin təməli ibtidai siniflərdə şagirdlərin nəzəri və praktik hazırlığı üzərində qurulur.

• İbtidai siniflərdə əmək hazırlığının nəzəri və praktik əsaslarının texnoloji cəhətdən təşkili sistem şəklində həyata keçirilir, didaktik olaraq fənn kurikulumlarında təsbit olunan standartlarla inteqrasiyanın tətbiqi ilə həllini tapır.

*Rəyçi: prof. M.Həsənov*

## İstifadə edilmiş ədəbiyyat

**1. “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”. //Azərbaycan məktəbi, 2013, №5.**

**2. İlyasov M. Şagirdlərin peşə seçməyə hazırlanması. B., 2009, s. 187.**

**3. Qasımova L., Ağayev Ş. Əmək insanın tərbiyə olunmasında mühüm vasitədir.// Azərbaycan məktəbi, 2014, №5.**

**Ш.Агаев**

**Интегративные задачи трудовой подготовки**

**Резюме**

**В статье повествовуется о трудовой подготовке интеграции в современных условиях, истолковываются теоритеческие и практические задачи интеграции.**

**Sh.Agayev**

**İntegrative issues of labor preparation**

**Summary**

**The article is dedicated to the students ‘professional training and integration, theoretical and practical issues of integration in modern environment.**



# "GÜC" MÖVZUSUNA AİD DƏRS NÜMUNƏSİ

**Günel Baxşıyeva,**
***Qax rayonu Arif Abbasov adına Turaclı kənd tam orta məktəbinin müəllimi***

***Açar sözlər:* dərs nümunəsi, sinif, fəal təlim metodu, müqayisə.**
***Ключевые слова:* урок пример, класс, метод интерактивного обучения, сравнение.**
***Key words:* lesson samples, class, interactive teaching method, comparison.**

Texnologiya əsri olan iyirmi birinci yüzillikdə texnikanın inkişafı və müasir dövrün tələblərinə uyğun olaraq bütün sahələrdə olduğu kimi təhsil sahəsində də uğurlu islahatlar aparılır. Bu da müəllimin üzərinə böyük məsuliyyət qoyur.

Müasir təlimin məqsədləri genişdir. Bunlardan ən əsası şagirdlərin dərsə marağını artırmaq və onları daha çox axtarıcılığa sövq etməkdən ibarətdir. Bu məqsədlə İKT-nin imkanlarından istifadə etmək məqsədəuyğundur.

Kurikulum islahatında şagird, müəllim, dərslik və İKT-nin zəncirvari bağlılığı mövzunun daha dərindən mənimsənilməsinə imkan yaradır. Bu cür qurulan dərslər mexaniki əzbərçiliyi tamamilə aradan qaldırır və şagird hər hansı bir anlayışı sanki yenidən kəşf edir və topladığı biliklərə dərindən yiyələnərək təcrübə aparmaqla buna daha çox əmin olur və beləliklə də, şagirdlərdə özünəinam və sərbəst fikir söyləmək bacarığı formalaşır.

Dərslərdə fəal təlim metodlarına üstünlük vermək dərsi daha effektli edir. Buna misal olaraq 7-ci sinifdə tədris olunan dərs nümunələrindən birini nəzərdən keçirək:

**Mövzu: Güc**

**Standartlar: 1.1.3. Mexaniki hərəkəti əlamətlərinə görə şərh edir.**

3.1.2. Mexaniki hadisələrə uyğun fiziki kəmiyyətləri ölçür, hesablamalar aparır.

Məqsəd: Dərsin sonunda şagird:

1. Mexaniki işin dəyişmə yeyinliyinin roluna dair sadə misallar göstərir.



2. Mexaniki gücün BS-də vahidini göstərir və onu əsas vahidlərlə ifadə edir.

3. Gücün zamandan asılılıq qrafikini təsvir edir.

**İnteqrasiya**: C.-1.2.1, Riy.-4.1.1, Riy.-5.1.1, T-i.-2.2.1

İş formaları: Kiçik və böyük qruplarla iş.

İş üsulları: Beyin həmləsi, klaster, müzakirə.

Resurslar: İş vərəqləri, mexaniki iş və gücə aid plakat, " Fizikadan multimedia" diski, kompyuter, proyektor, müəllim tərəfindən hazırlanmış slayd, marker.

**Motivasiya**: Proyektor vasitəsilə lövhədə turpun nağılını nümayiş etdirirəm.

Şagirdlər nağılı seyr etdikdən sonra aşağıdakı sualları verirəm:

1. Müəllim: Baba nə üçün turpu tək çıxara bilmədi?

Şagird: Turp böyük olduğu üçün babanın gücü çatmadı.

2. Müəllim: Başqa hansı qəhrəmanlar babaya köməyə gəldi?

Şagird: Nənə, nəvə, toplan, məstan, siçan babaya köməyə gəldilər.

3. Müəllim: Uşaqlar, nağıldan hansı nəticəni çıxardınız?

Şagird: Güc birlikdədir.

Daha sonra digər materialı nümayiş etdirirəm.




Müəllim: Uşaqlar söhbət nədən gedir?

1-ci şagird: Balaca at və zəif adam gücsüz, ana at və qüvvətli adam daha güclüdür.

2-ci şagird: El gücü, sel gücü. Elin gücü bir olsa, dağ oynadar yerindən. Elmin gücü, yıxar bürcü.

3-cü şagird: Ümumilikdə söhbət gücdən gedir.

Şagirdlərin cavabları dinlənildikdən sonra növbəti şəkli göstərirəm. Şəkildə fəhlə və kran nümayiş etdirilir.



Tədqiqat sualı:

Fəhlə və kran bir maşın kərpici 3-cü mərtəbəyə qaldırarkən eyni iş görür? Hansı daha çox vaxt sərf edir?

Şagirdlərin cavablarını yekunlaşdırdıqdan sonra əlavə olaraq güc nədir, işarəsi, düsturu, vahidi, əlavə vahidləri, gücün zamandan asılılıq qrafiki haqqında qısa nəzəri məlumat verirəm.

Görülən işin bu işin görülməsinə sərf olunan zaman müddətinə nisbəti güc adlanır:

$$N = \frac{A}{t}$$

Gücün vahidi ingilis alimi C.Vattın ərəfinə BS-də vatt qəbul edilmişdir.

$$(N) = \frac{(A)}{(t)} = \frac{1\ C}{san} == 1Vt$$

Gücün aşağıdakı əlavə vahidləri var:

$1mkVt = 10^{-6}Vt$

$1mVt = 10^{-3}Vt$

$1kVt = 10^{3}Vt$

$1MVt = 10^{6}Vt$

Gücün zamandan asılılıq qrafiki şəkildəki kimidir.

N (VT) t (san)

**Tədqiqatın aparılması:**

Şagirdləri 3 qrupa ayırıram və hər qrupa mövzuya uyğun adlar verirəm. Tədqiqatı aparmaq üçün qruplara işçi vərəqləri paylanır və vaxt verilir:

**I tapşırıq**

**I Qrup (İş)**

1. Güc nədir?
2. Gücün vahidi kimin şərəfinə adlandırılmışdı?

**II Qrup (Enerji)**

1. Güc hansı hərflə işarə olunur?
2. Gücün düsturunu yazın.

**III Qrup (Güc)**

1. Gücün zamandan asılılıq qrafikini çəkin.
2. At qüvvəsi nədir?

**Məlumatın mübadiləsi və müzakirəsi**

Tədqiqat üçün ayrılmış vaxt bitdikdən sonra tapşırığın icrasının başa çatdığını bildirirəm. Hər qrupdan bir lider seçilir və iş vərəqləri lövhədən asılır. Qrup liderləri öz qrup işlərini təqdim edir və tapdıqları cavabları əsaslandırırlar. Əldə etdikləri yeni informasiyaları (tapdıqları cavabları) digər qruplarla bölüşürlər.

**I Qrup (İş)** 1. İşin görülmə yeyinliyi güc adlanır.

2. Gücün vahidi C.Vattın şərəfinə Vt adlandırılmışdır.

**II Qrup (Enerji)** 1. Güc N hərfi ilə işarə olunur.

2. Güc $N = \frac{A}{t}$ düsturu ilə hesablanır.

**III Qrup (Güc)**

1. Gücün zamandan asılılıq qrafiki aşağıdakı kimidir.




2. Texnikada bəzən güc vahidi kimi at qüvvəsi (a.q) də istifadə edilir.

1a.q=736 Vt

**2-ci tapşırıq. Yaradıcı tətbiqetmə.**

**I Qrup (İş)**

İdmançı ştanqı başı üzərinə 4 san. müddətinə qaldırarkən 3800 C iş gördü. Onun gücünü hesablayın.

**II Qrup (Enerji)**

Tayavuran traktor 120 kq ot qalağını 5m hündürlüyə 6 san. müddətinə qaldırır. Tayavuran mexanizmin gücünü hesablayın. (g=10m /san$^2$).

**III Qrup (Güc)**

Qaldırıcı kran 600 kq yükü 20 m hündürlüyə 30 san.-yə qaldırır. Kranın mühərikinin gücünü hesablayın (g=10m/san$^2$)

**Məlumatın mübadiləsi və müzakirəsi**

**I Qrup (İş)**

$$N = \frac{A}{t} = \frac{3800}{4} = 950\text{Vt}$$

**II Qrup (Enerji)**

$$N = \frac{A}{t} = \frac{mgh}{t} = \frac{120 \cdot 10 \cdot 5}{6} = 1000 \text{ Vt}$$

**III Qrup (Güc)**

$$N = \frac{A}{t} = \frac{mgh}{t} = \frac{600 \cdot 10 \cdot 20}{30} = 4000 \text{ Vt}$$

Qrup işləri meyar cədvəlinə əsasən qiymətləndirilir.

| qruplar / meyarlar | İş | Enerji | Güc |
|---|---|---|---|
| Əməkdaşlıq | | | |
| Tədqiqatçılıq | | | |
| Təqdimat | | | |
| Axtarıcılıq | | | |
| Məntiq | | | |
| Natiqlik | | | |
| Ümumiləşdirmə | | | |

Nəticə və ümumiləşdirmə: Sonra şagirdlərin cavablarını ümumiləşdirirəm və əlavə olaraq qeyd edirəm ki, hər hansı bir maşını alarkən onun texniki pasportunda gücü haqqında məlumat yazılır. Bu məlumat çox zaman at qüvvəsi ilə ifadə olunur. Ölkəmizdə at qüvvəsi 736 Vt, ABŞ-da və İngiltərədə 746 Vt, Rusiyada 735 Vt qəbul olunub.

Qiymətləndirmə:

Dərsi yekunlaşdırdıqdan sonra hər bir şagirdin fəaliyyətini ayrılıqda meyar cədvəlinə əsasən qiymətləndirirəm:

| I səviyyə | II səviyyə | III səviyyə | IV səviyyə |
|---|---|---|---|
| Mexaniki işin dəyişmə yeyinliyinin roluna dair sadə misallar göstərə bilmir. | Mexaniki işin dəyişmə yeyinliyinin roluna dair sadə misalları müəllimin köməyi ilə göstərir. | Mexaniki işin dəyişmə yeyinliyinin roluna dair sadə misalları qismən göstərir. | Mexaniki işin dəyişmə yeyinliyinin roluna dair sadə misalları düzgün göstərir. |
| Mexaniki gücün BS-də vahidini göstərmir və onu əsas vahidlərlə ifadə edə bilmir. | Mexaniki gücün BS-də vahidini müəllimin köməyi ilə göstərir və onu əsas vahidlərlə ifadə edir. | Mexaniki gücün BS-də vahidini əsasən göstərir, onu əsas vahidlərlə ifadə edir və onlara aid hesablamalar apararkən bəzi səhvlərə yol verir. | Mexaniki gücün BS-də vahidini düzgün göstərir, onu əsas vahidlərlə tam ifadə edir və onlara aid hesablamaları düzgün aparır. |

Ev tapşırığı: İnternetdən istifadə edərək güc haqqında və C.Vattın ixtirası- buxar maşını haqqında əlavə məlumat toplamaq.

Nəticə etibarilə bu mövzunu öyrənərkən şagird sadəcə güc haqqında məlumat almır, o həm də fizika və həyat ikilisi arasındakı əlaqələri də öyrənir.

*Rəyçi: dos. Ə.Gərayev*

**Г.Бахшыева**

**Урок пример на тему мощность**

**Резюме**

В статье говорится о роли прямой связи учащегося, учителя, учебника и ИКТ в усвоении темы. А также говорится о том, что повышение интереса к уроку, является одним из основных целей преподавания.

**G.Bakhsiyeva**

**Lesson sample on the topic “power”**

**Summary**

İn the article it is spoken about the relations among student, teacher, textbook and information-communication technologies and their role in comprehending the material. İt is also noted that the main goal of teaching is to enhance students’ interest in learning and involve them to the research.

***Tərbiyə məsələləri***

# İNTELLEKTUAL İNKİŞAFIN İLK QAYNAQLARI

**Füzuli Əsgərli,**
***Azərbaycan Dövlət Pedaqoji Universitetin dosenti, filologiya üzrə fəlsəfə doktoru***

***Açar sözlər:** sehrli nağıllar, şifahi ədəbiyyat, fantastika.*
***Ключевые слова:** волшебные сказки, фольклор, фантастические произведения.*
***Key words:** fairy tales, folklore, fantastic works.*

"Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı"nda təhsilalanların intellektual inkişafına, istedadlıların orta yaşdan aşkar olunub, dəstəklənməsinə ardıcıl fikir verilməsi, uşaqların kiçik yaşlarından təfəkkür və təxəyyülünün formalaşdırılması xüsusi qeyd edilmişdir. Bu baxımdan hələ məktəbəqədər dövrdən başlayaraq uşaqlarda düşündürücü şifahi xalq ədəbiyyatı nümunələrinə maraq yaradılmasına ardıcıl fikir verilməlidir. Uşaqlara kiçik yaşlarından aşılanan belə süjetli əsərlər daha ciddi əhəmiyyət kəsb edir. Təşəkkül tapdığı gündən məktəblə əlaqədə olan bu sənət nümunələri müəyyən tənəzzül və tərəqqi dövrü keçirməsindən asılı olmayaraq tərbiyəvi mahiyyəti etibarilə həmişə güclü təsirə malik olmuşdur. Bu qaynaqların ən maraqlı nümunəsi məzmunlu əsərlər, nağıl, əfsanə, rəvayət və dastanlardır. Onların tərbiyəvi təsiri sonrakı yaş dövründə də öz mahiyyətini itirmir. Bəzi valideynlər belə düşünür ki, dəqiq elmlərə, müasir İKT-yə marağı olan şagirdlərə şifahi xalq ədəbiyyatı nümunələrini oxumaq faydasızdır. Lakin ən mürəkkəb qurğuları hazırlayan alimlər də etiraf edirlər ki, kosmik gəmiləri hazırlayan ixtiraçı dahilər, konstruktorlar, layihəçilər də ilk fantaziyalarını, təxəyyülün inkişafını sehrli nağılların hesabına qazanmışlar. O sehrli dünya onları öz arxasınca elmin sehirli aləminə aparmışdır.

Təsadüfi deyildir ki, ilk kosmonavt Yuri Qaqarinin kosmosa yolu "Andromeda dumanlığı" fantastik əsərini oxuyandan sonra başlanmışdır. Cəzbedici nağıl və dastan dünyasının bir şirinliyi də ondadır ki, maraq doğuran sirli məqamlarla zəngindir. Araşdırmalar vasitəsilə bu məqamların üst mina qatını açdıqca və ona dərindən nüfuz etdikcə insan təfəkküründə yeni təsəvvürlər yaranır, bu məqamların üzə çıxarılması üçün elmi mülahizələrə geniş meydan açılır. Bəzi məsələlərə diqqət yetirdikdə məqsəd daha aydın hiss olunur.

Sehrli nağıllarda maraqlı surətlərdən biri insanlarla həmişə üz-üzə gələn və əsasən, onları tilsimə salmağa, ya da fiziki cəhətdən məhv etməyə çalışan, onları qaranlıq məkanlarda əsir edən əzazil divlərdir. Bu mifoloji varlıq "Avesta"nın güruhundan hesab olunur. Bəzən nağıllardakı divlər müxtəlif şəkildə xarakterizə olunur. Folklorşünas alim M.Təhmasibin "Azərbaycan xalq ədəbiyyatında div surəti" əsərinin elmi dəyərini də, "Avesta" kitabında insanlara qarşı şər qüvvə kimi təsvir olunan divin hələ zərdüştlükdən çox-çox əvvəl xeyirxah qüvvələrlə əlaqəli olduğunun sübuta yetirilməsi faktı da

bunu müəyyən edir.

Bəzi təsviri hallarda divlərin müsbət və ya mənfi obraz kimi çıxış etmələri xalqın müxtəlif xarakterli sehrli varlıqlara güclü inam və etiqadı, yaxud ziddiyyətli münasibətləri ilə əlaqəli olmuşdur. Təsadüfi deyildir ki, fars şairi Ə.Firdovsi "Şahnamə" əsərinin başlanğıcında nağıl mənbələrindən bəhrələnərək insanlarla fərqli münasibətdə olan div surətlərini yaratmışdır. Kəyumərs şahın oğlu Səyamək qara divin əlində həlak olur. Lakin təkrar döyüşdə Təhmurəsə məğlub olan divlər məhv etməməsi üçün ona yalvarırlar, onlara yazmaq və oxumağı öyrətmək xidmətini təklif edirlər.

Əsərin tərcüməçisi, şərqşünas alim M.Əlizadə öz araşdırmalarından çıxış edərək qeyd edir ki, "Şahnamə"ni yazarkən Firdovsinin hansı yazılı mənbədən faydalandığı barədə müəyyən qənaətə gəlmiş oluruq… Dahi şairin belə bir ölməz əsər yazarkən istifadə etdiyi birinci dərəcəli mənbə, tükənməz xəzinə, özünün dönə-dönə qeyd etdiyi kimi, dünyagörmüş ağıllı, müdrik adamlardan eşitdiyi nağıllar, dastanlar olmuşdur". Yaxud Ə.X.Dəhləvi "Məcnun və Leyli" poemasının giriş hissəsində verdiyi mənzum hekayədə Süleyman peyğəmbərlə divlərin münasibətini təsvir etmişdir.

Nağıllarda təsvir olunan divlər insanlarla həmişə təmasda olmağa çalışmışlar ki, bu da qədim insanların dərin inamı və etiqadı ilə bağlıdır. Midiyalıların ən uca saydıqları varlıq div – Devuş olmuşdur. Div onlar üçün tanrı – işıq, xeyirxahlıq, yaradıcı, işıq Allahı idi. Əski sanskrit dilində isə "div" sözü "işıq Allahı" mənasındadır.

Ona görə də bir sıra nağıllarımızda bu divlərin odla, işıqla birgə xatırlanmaları təsadüfi deyildir. Məsələn, "Cəlayi-vətən" nağılının qəhrəmanı, divlə insanın izdivacından doğulmuş Vətən də qeyri-adi, yenilməz qüvvəyə malikdir. Sehri ilə şəhərin bütün əhalisini daşa döndərən sehrkar keşiş nə qədər püfləsə də, onun təsiri divdən törənmiş Vətənin halına təfavüt etmir.

Nağıllarda təsvir olunan bir sıra igid qəhrəmanlar müxtəlif situasiyalarda insanlar üçün sirli gücə malik və müqəddəs görünən, canlıların həyat atributlarından biri olan suyun ecazkar qüdrətindən dünyaya göz açırlar. Görkəmli tədqiqatçı M.Seyidov bu səpkili nağılların elmi, fəlsəfi mahiyyətini açmış, bir sıra sirli məqamlara aydınlıq gətirmişdir: "…Bir çox əski xalqların, o sıradan azərbaycanlıların soykökləri̇ndə iştirak edən soy birləşmələri və onların ulu babaları köklərini öz onqonlarında axtardıqlarından (əsasən, ulu nənə-ana ilə), onqonla, totemlə (antromorfik, zoomorfik) eyni kökdən olduqları inamı ilə yaşadıqlarından, insanın heyvanla (onqonla) yaxınlığına da inanmışlar. Bu yaxınlıqdan, əlaqədən yaranan insan - varlıq, adətən, yarıtotem, yarıilahi olurdu".

"Reyhanın nağılı"ndakı Ayğır Həsən də insan övladının belə bir inam və etiqadından (dərya atlarının fərqli qüvvəyə malik olması inamından) dünyaya göz açdığına görə o, bütün şər qüvvələrə qalib gəlir. Səkkiz yaşında elə bir qüvvəyə malik olur ki, "dağa əl atsaydı yerindən qopardı. Axşama kimi çöldə uşaqlarla oynayırdı. Hər kəs onunla güləşsəydi, qolpaça eləyib, qıçını bir yana, qolunu da bir yana atardı".

Görkəmli ingilis etnoqrafı və din tarixçisi C.Frezer bitkilərin müqəddəs bir varlıq kimi insan təfəkküründə uzun müddət yaşadığını faktlarla sübuta yetirməyə çalışır və qeyd edirdi ki, "Vanik qəbiləsindən olan tüzemlər (Şərqi Afrikada) belə təsəvvür edirlər ki, hər bir ağacın, xüsusilə də kokoslu palmanın canı vardır. Ona görə kokoslu palmanı kəsmək doğma ananın qətlinə bərabər tutulur. Çünki analar öz körpələrinə həyat və qida verdiyi kimi, ağaclar da insanlara həyat və qida verirlər".

Görkəmli alim maraqlı bir misal

gətirir: “Cənubi slavyanlarda övlad həsrətində olan sonsuz qadınlar Müqəddəs Georgi günü ərəfəsində meyvə gətirən ağaca təzə köynəklərini sərirlər. Ertəsi gün səhər tezdən gün çıxmamış köynəyi diqqətlə gözdən keçirirlər. Əgər köynəyin üzərində hansısa bir canlı həşərat sürünürsə qadın ümid edir ki, onun arzuları yerinə yetəcək. O həmin köynəyi əyninə geyir, inanır ki, o da bu bar gətirmiş ağac kimi bar verəcəkdir”.

İnsanların bu tükənməz inamı bir sıra dünya xalqlarının həm şifahi, həm də yazılı ədəbiyyatında özünü büruzə verir. Almaniya və Skandinaviya ölkəsində bu tipli sehrli nağılların bir sıra yazılı ədəbiyyatın yaranmasına böyük təsiri olmuşdur. Bu, həm Qrimm qardaşlarının, həm də Andersenin yaradıcılığında özünü büruzə verir. Bütün bunlar, təbii ki, müxtəlif Şərq xalqlarının şifahi yaradıcılığından irəli gələn məlum motivlərin hesabına meydana çıxmışdır. Avropanın bir sıra görkəmli yazıçılarının Şərq motivlərindən bəhrələnməsi bizi heyrətləndirmək gücündə deyildir. Çünki qədim tarixə malik olan Şərq xalqları folklorunun və o cümlədən yazılı ədəbiyyatının zənginliyi bunu deməyə əsas verir. Dünyanın bir çox görkəmli sənətkarları qədim Şərq ədəbi nümunələrindən bəhrələndiklərini etiraf etmişlər. Danimarka yazıçısı H.X.Andersen yaradıcılığında ərəb şifahi ədəbiyyatından – “Min bir gecə” nağıllarından bəhrələndiyini dilə gətirmişdir.

“Düyməcik” nağılı eyni ilə Şərq həyatını xatıladır. Bu əsərdə Azərbaycan xalq nağıllarında mövcud olan doğulma motivlərinin izlərini də görmək olur. Bu səpkili Azərbaycan nağıllarında insan almadan, bir içim sudan və digər inancların qüdrətindən, “Düyməcik”də isə əsas obraz falçı qadının verdiyi arpa dənəsindən doğulur. Buraya Andersenin yazıçılıq məharətini də əlavə etsək, fərqi yalnız bunda görmək mümkündür.

Nağıllarımızda qeyri-adi şəkildə doğulan uşaqlar körpə yaşlarından özlərinin fövqəltəbii hərəkətləri ilə sonralar xalqa arxa duran yenilməz bir qəhrəmana, xalqın müdafiəçisinə çevrilir. Bu baxımdan, “Zəngi” nağılı daha səciyyəvi görünür. Hambal oğlu Zəngi hələ qundaqda ikən padşaha elə bir şillə vurur ki, yer-göy padşahın başına hərlənir. Bu əlamətlər Zənginin qeyri-adi doğulan qəhrəman xarakterinə malik olduğunu təsdiq edir.

Lakin zaman ötdükcə, insan hafizəsi və şüuru cilalandıqca təsəvvürlər dəyişmişdir. Bu tipli nağıl qəhrəmanların doğuluşunu qədim insanların təxəyyülündə kütləvi şəkildə deyil, yalnız yarımallahlar qismində, qeyri-adi görünən formada saxlaya bilmişlər.

İbtidai təsəvvürlərə görə, insan bu gün də bizə məlum olan cismani ölümdən sonra da ruhən yaşayır və yeni doğulmuş körpə şəklində təzədən maddi dünyaya qayıdır. İbtidai insanlar dirilər ilə ölüləri fikrən fərqləndirmək imkanına malik olmadıqlarına görə, yeni doğulmuş uşağı ölmüş adamın yenidən dünyaya qayıtması kimi başa düşürdülər. Məsələn, qədim hindlilər yeni uşaq doğulanda sehrbaz çağırır, axirət dünyasından kimin qayıtdığını və yeni doğulan körpəyə hansı adın verilməsini o müəyyən edirdi.

Qədim dünya xalqlarının hər biri bəşər övladının ölümünü (axirət dünyasını) müxtəlif dərəcəyə malik ibtidai şüur səviyyəsində dərk etmişlər. Bu gün də elm aləmində hələlik tam şəkildə varlığı təsdiqini tapmamış ruhun mövcudluğu barədə hər bir xalqın (qəbilə və tayfanın) baxışı və özünəməxsus təsəvvürləri olmuşdur. Bir vaxtlar buryatlar və tunquslar insanların başının üstünü alan ölümü Allahın göndərdiyi təbii bir cəza kimi qəbul etmişlər. Buradan aydın görünür ki, ruh məsələsinə dünya xalqları müxtəlif inancla yanaşmış və

bunun mövcud olub olmadığını dürüstlüyü ilə öyrənmək marağında olmuşlar. Hətta insanlar üçün bir sirr olaraq qalan bu dumanlı təsəvvürə aydınlıq gətirmək istəyi bir sıra dünya xalqlarının yazılı ədəbiyyatında aktual mövzu səviyyəsinə qalxmışdır.

Klassik eston yazıçısı A.Tammsaare "İstintaq" əsərində bu sirli məqamın bədii şərhini yazıçı təxəyyülünün gücü ilə oxuculara daha maraqlı görünən əhvalatlar çərçivəsində təsvir etməyə səy göstərmiş, əsər yazılan dövrdə ruh probleminin elmi şərhi bəşəriyyətə məlum olmadığına görə yazıçının özünə də qaranlıq olduğu üçün əsərin sonunu inandırıcı nəticə ilə tamamlamağa cəhd göstərməmiş, elmə sirli görünən məqamın dərkini oxucuların ixtiyarına buraxmağa üstünlük vermişdir.

Azərbaycan yazıçısı M.Süleymanlının "Köç" romanında da ibtidai təsəvvürdə inanclar səviyyəsində canlandırılan ruh məsələsinin bir sıra təsvirinə rast gəlirik. Yazıçı qədim dövrün bu adətlərini tədqiq etdiyinə və dərindən bildiyinə görə bu sirli məqamın bədii şərhini məharətlə təsvir edə bilmişdir.

Müxtəlif tarixi mövzulu tədqiqat əsərlərini araşdırdıqca və alimlərin ağılabatan fikirləri ilə tanış olduqca bəzi sirli məqamların üzə çıxmasının şahidi oluruq. Tanınmış arxeoloq R.Göyüşov öz əsərində yazır: "…Ağdaşda, Ucarın Bəhmənbərgüşad kəndi ərazisində və Qutqaşen rayonunun (indiki Qəbələ rayonu – F.Ə.) Həzrə kəndində aşkar olunan küp qəbirlərində ölülər cüt-cüt basdırılmışdır. Bir qayda olaraq, ölülər dizdən çox bükülü, əlləri üzünə doğru qaldırılmış halda sol və ya sağ böyrü üstə dəfn edilmişdir".

Bu dövrlərdə dünyasını dəyişmiş insanlar ana bətnində olduğu kimi – başı aşağıya doğru, üzü qarına tərəf çevrilmiş, dizlərdən bükülü, əlləri alına, çənə nahiyəsi isə dizlərə sıxılı vəziyyətdə dəfn olunurdular. Bu dəfnin özü də ibtidai təfəkkürün kainatın təbii qanunlarına yanaşma dərəcəsinə uyğun olaraq yaranırdı. Ölmüş insanı ana bətnində dünyaya gələcək uşaq şəklində dəfn etməklə yenidən dünyaya uşaq şəklində qayıdacaq inam və etiqadı uzun müddət təsəvvürlərdə yaşamışdır.

Ən qədim dövrlərdə belə bir adət mövcud olmuşdur ki, insan həyatını itirərkən onu torpaqda dəfn etmək məqbul sayılmamış, yalnız inanc və etiqadlara uyğun gələn yas mərasimləri icra olunmuşdur. Belə ki, dünyasını dəyişmiş insanın cəsədini müəyyən edilmiş xüsusi yerə qoyardılar, ət iyini duyub ora  uçub gələn yırtıcı quşlar bədənin ətini yedikdən sonra isə yerdə qalan sümüklərini bir yerə yığardılar. Y.V.Çəmənzəminlinin "Qızlar bulağı" əsərində bu təsvirə rast gəlirik.

İnsanların əxlaqi-mənəvi inkişafında və formalaşmasında, mədəniyyət abidələri sırasında görümlü yer tutan "Dədə Qorqud" dastanları milli mədəniyyətimizin ən zəngin, ulu qaynaqlarından biridir. Lakin bu qədim dastanda xalq nağıllarının izini görməmək mümkün deyildir.  Görkəmli ədəbiyyatşünas Ə.Sultanlı dastandan bəhs edərək yazırdı: "Dastanda sehr, tilsim, yuxu və möcüzə ilə bağlı bir neçə səhnə var. Birinci boyda boz atlı Xızırın gəlib oğlanın yarasını sığması, ikinci boyda Qazanın gördüyü yuxu, üçüncü boyda Dədə Qorqudun ismi-əzəm oxuyaraq Dəli Qacarın əlini yuxarıda saxlaması, beşinci boyda Dəli Domrulun Əzrayıl ilə görüşü, səkkizinci boyda günbəzin yarılması, Təpəgözün əsrarəngiz qılıncını Basatın əldə etməsi və sair səhnələr xalq nağılları ilə sıx bağlıdır…Beləliklə, "Dədə Qorqud" dastanının məzmununda gördüyümüz bu xalq yaradıcılığı ünsürləri onun xalq ədəbiyyatı ilə, xalqın dünyagörüşü ilə nə qədər bağlı olduğunu göstərir…"

Əcdadlarımızın şifahi yaradıcılıq əmanəti kimi dövrümüzə kimi gəlib çatmış

bu qədim dastanlarda Azərbaycan xalqının dərin ictimai keçmişi, milli ruhu, ləyaqəti, qüruru, adət-ənənəsi, məişəti əks olunmaqla yanaşı, əsas məqsədi isə doğma vətəni müdafiə etmək, onun bütövlüyünün, milli istiqlaliyyətinin xarici və daxili sarsıntılardan qorunmasını nəsillərə təbliğ etməkdir.

Xalq əfsanə və rəvayətlərində deyildiyi kimi, bu müdrik, uzun ömrə malik olan pirani qoca eyni şəxs olaraq, bəlkə də bir-birindən zaman mərhələləri ilə ayrılan müxtəlif dövrlərin müasiri qismində təsvir olunmuşdur. Belə ki, “oğuz qövminin müşkülini həll edən”, ilahi vergili bu görkəmli şəxsiyyət özünün təmsil etdiyi zamanın övladı olduğuna görə təkcə bəşər övladlarının adqoyma mərasimlərində iştirak etmir, eyni zamanda, kainatda mövcud olan digər canlı və cansız varlıqların adlarını da Dədə Qorqud qoyur: “Adını bən dedim, yaşını Allah versin!” və sair.

Yazılı milli uşaq ədəbiyyatımızda da Dədə Qorqud xarakterli və ya ona bənzər bir sıra müsbət obrazlara rast gəlmək mümkündür. A.Şaiqin “Tapdıq dədə” poemasında Tapdıq dədə, Zahid Xəlilin “Küp” pyesində Qurban dədə və sair.

Yaxud özbək eposu “Alpamış”dakı obrazları-Alpamışı, onun sevgilisi Bərçinayı, bacısı Kaldırqaçı, sadiq dostları Qaracan və Keyqubadı “Dədə Qorqud”dakı obrazlarla paralelləşdirə bilirik. Məsələn, Alpamış Qaracan ilə dostluq əlaqəsi yaradaraq, onunla birgə doxsan pəhləvana qalib gəlir. Və ya Keyqubad adlı çoban Alpamışa kömək edərək Kalmık şahını taxtdan salır. Yaxud iki hissədən olan bu dastan “Bamsı Beyrək boyu”nu xatırladır.

Azərbaycan uşaq ədəbiyyatının folklor motivləri ilə əlaqəsi onun müsbət yaradıcılıq keyfiyyətinə səbəb olmuşdur. Həmçinin bu motivlər bir mənbə və məxəz kimi yazıçılarımızın diqqətini cəlb etmiş, qələm sahibləri öz fərdi yaradıcılıq səviyyəsinə uyğun olaraq mənbəni təkrar etməmək şərti ilə özlərinin orijinal əsərlərini yazmışlar. Uşaq yazıçısı M.Rzaquluzadə daha çox “Dədə Qorqud” dastanlarının bir neçə boyundan istifadə etmişdir. Yazıçı dastan motivlərinə yaradıcı yanaşmış, “Dirsə xan oğlu Buğac xan boyu”nun motivləri əsasında “Ana ürəyi, dağ çiçəyi”, “Salur Qazanın evinin yağmalandığı boy”undan bəhrələnərək “El gücü”, “Baybörənin oğlu Bamsı Beyrək boyu”ndan istifadə edərək “Dəli ozan” hekayəsini qələmə almışdır. Yazıçı boyun ideya istiqamətini saxlamaqla, dövrün tələblərini nəzərə almış, ideoloji çalarları daha qabarıq verməyə, əsas məqsəd olan qəhrəmanlıq və vətənpərvərlik ruhunu qoruyub saxlamağa çalışmışdır. “Ana ürəyi, dağ çiçəyi” hekayəsinin süjet xəttində eyniyyət olsa da, obrazların dili, xarakterik xüsusiyyətləri bu və ya digər hadisələrin təsviri dastandan fərqli şəkildə nəzərə çarpır. “Salur Qazanın evinin yağmalandığı boy”u əsasında yazılmış “El gücü” hekayəsində müəllif Qazan xan obrazının müsbət cəhətlərini göstərməklə yanaşı, onun zəhmətkeş xalqla əlbir olmamasını, hər şeyi öz üzərinə götürməsini, nəticədə, el-obasının talan edilməsini onun mənfi xüsusiyyəti kimi təsvir etmişdir.

Müəllifin bu əsərində eposun orijinallığına xələl gətirən bir sıra əlavələri sovet dövrünün siyasi ideologiyasından irəli gələn təsir ilə bağlamaq lazım gəlir. Əsərdən göründüyü kimi, mövcud ideologiyanın tezislərinə uyğun gəlməyən Qazan xan obrazı dastandakı kimi real təsvir edilməmişdir. Guya o, elin gücü ilə hesablaşmayaraq yalnız özünə uyğun varlı bəylərlə birləşir, aşağı təbəqəli insanların köməyindən yararlanmağı özünə əskiklik sayır. Qazan xandan fərqli olaraq, aşağı təbəqənin nümayəndəsi Qaraca çoban isə bitkin bir obraz kimi daha qabarıq verilir və xalq qəhrəmanı səviyyəsinə yüksəldilir.

M.Rzaquluzadə "Dəli ozan" hekayəsində "Bayborənin oğlu Bamsı Beyrək boyu"na bir qədər fərqli yanaşmışdır. Hekayənin başlanğıcı dastandakı hadisələrə uyğun şəkildə verilsə də, yazıçı bədii təxəyyülü hesabına əsəri orijinal şəklə salmış, quldurluqla gününü keçirən Şöklü Məliyi buraya əlavə etmişdir. Bu quldur tikdirdiyi bir qəsri özünə məkan seçərək insanları oğurlatdırır, onları qul bazarında satdırır, yaxud nağıllardakı əzazil divlər kimi yeraltı qaranlıq mağaralarda saxlayır, işgəncələr verir, ayaqlarından asdırır və sair. Yazıçı yaradıcılıq imkanlarından istifadə edərək hekayəni daha maraqlı etmək üçün folklor janrlarından daha geniş istifadə etməyə çalışmışdır. Toy ərəfəsində yoldaşları ilə oğurlanan Beyrək gəmiçiyə satılır, beş il bu gəmidə avar çəkir, əldə etdiyi yeyə ilə zənciri kəsərək xilas olur. Son hadisələr isə yenə də dastanla eyniləşir, Beyrək Banıçiçəyə qovuşur və sair.

"Koroğlu" dastanının çoxvariantlı olması bir fikri qüvvətləndirir ki, dünya xalqları şifahi və yazılı ədəbiyyatlarını yaradarkən bir-birindən bəhrələnmişlər. Lakin "hər bir xalq "Koroğlu" süjetini öz yaradıcılıq ənənəsinə uyğun işləmiş, özlərinə məxsus yeni variantlar yaratmışlar".

Bir sıra variantlarda ("Goroğlu", "Qurqulu" və s.) nağılçılıq üstünlük təşkil edir. Dastan qəhrəmanları sehrli nağıllarda olduğu kimi divlər və əjdahalarla mübarizə aparırlar. Yaxud pərilərin köməyi ilə bu varlıqlar üzərində qələbə çalırlar.

Bu çoxvariantlı dastanın nağılvari təsvirli olması təbiidir. Bir sıra yazılı ədəbi nümunələrdə (Ə.Firdovsinin "Şahnamə", Ə.Nəvainin "Fərhad və Şirin" və s.) nağıl təsirini görmək olur.

Ayrı-ayrı təhlillərdən də göründüyü kimi, müxtəlif janrlı folklor nümunələri yazılı ədəbiyyatımız üçün zəngin mənbə olmuşdur. Bu motivli qaynaqlardan məharətlə istifadə etmiş görkəmli sənətkarlar bu yolla öz orijinal əsərlərini yarada bilmişlər.

Unudulmamalıdır ki, müasir insanın mütaliə tələbatının artırılmasını şərtləndirən amillərdən biri elmi-texniki nailiyyət olsa da, şifahi xalq ədəbiyyatı nümunələri bu nailiyyətlərin ilk qaynaqlarıdır.

*Rəyçi: prof. Zahid Xəlil*

## İstifadə edilmiş ədəbiyyat


**1. Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri. Bakı, 2014.**

**2. Azərbaycan şifahi xalq ədəbiyyatına dair tədqiqatlar. VIII cild. Bakı: Səda, 1999.**

**3. Xəlil Z., Əsgərov F. Uşaq ədəbiyyatı. Bakı, 2007.**

**4. Художественное восприятие. Свочнил: Наука, 1971.**


**Ф.Аскерли**

**Начала источнков интеллектуального развития**

**Резюме**

**В статье повествуется о воспитательном влиянии фольклорных примеров, в том числе легенд, сказок и саг.**

**F.Asgarli**

**First sources of intellectual development**

**Summary**

**In the article it is spoken about the examples of folk literature, as well as legends, tales epos and their educative impact.**



# QAYĞI SÖZÜ VƏ QAYĞI ÖZÜ

**Səidə Səlimzadə,**
***13 nömrəli Bakı Peşə Məktəbinin direktoru***

***Açar sözlər:*** ***xalça, milli sərvət, layihələndirmə, harmoniklik, miniatür, rəngkarlıq.***
***Ключевые слова:*** ***ковер, национальное богатство, проектирование, гармония, миниатюрный, живопись.***
***Key words:*** ***carpet, national wealth, design, harmony, miniature, painter.***

Azərbaycanın xalq şairi Rəsul Rzanın sərlövhədəki sözlərini hazırkı sənət abidələrimizə də şamil etmək olar. Həqiqətən də, uzun illər qayğı sözünə bürünən sənət əsərləri yalnız ötən əsrin ikinci yarısından sonrakı illərdə qayğı ilə əhatə olunmağa başlamış, müstəqillik dövründə öz əsl himayədarlarını tapmışdır. Ölkəmizdə mədəni irsimizin qorunub saxlanması, onun ayrı-ayrı sahələrinin inkişafı, həm də bunların gələcək nəsillərə çatdırılması, həmçinin dünyada təbliği sahəsində ardıcıl və məqsədyönlü iş də məhz müstəqillik illərindən başlanmışdır. Bu sahədəki işlər ulu öndər Heydər Əliyevin aşağıdakı sözləri ilə istiqamətlənmişdir: “Hər bir xalqın mədəni irsi onun milli sərvəti, tarixi və bu günüdür”. Bu sahələrdən biri də xalçaçılıqdır.

Böyüməkdə olan nəslin hərtərəfli təhsilə yiyələnməsində bu qədim sənətin də öz yeri görünür. Bu ecazkar abidələrin öz inkişaf yolu vardır. Ölkəmizdə yetmiş-səksəninci illərdə milli-mənəvi sərvətlərimizə verilən qiymət, göstərilən qayğı və diqqət doxsanıncı illərdə müstəqillik dövründən yeridilən dövlətçilik siyasətinin tərkib hissəsinə çevrildi, diqqət mərkəzində saxlandı.

Belə sənət nümunələri qədim xalılaların muzey qoruğu olan “Xalça Muzeyi”ndə öz təcəssümünü tapmışdır.

Xalça Muzeyinin qızıl fondunu xovlu xalçalar təşkil edir. Burada Azərbaycanın 7 əsas xalçaçılıq məktəbi - Quba, Bakı, Şirvan, Gəncə, Qazax, Qarabağ və Təbriz məktəbləri təmsil olunub. Muzeydə həmçinin xovsuz xalçaların nadir nümunələri də saxlanılır.

Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti Mehriban Əliyevanın böyük səyləri sayəsində milli xalçaçılıq sənəti 2010-cu ildə YUNESCO-nun Bəşəriyyətin qeyri-maddi irsinin reprezentativ siyahısına daxil edilib. Hər il noyabrın 16-sı ölkəmizdə Azərbaycan Xalçası Günü kimi qeyd edilir.

Azərbaycanın tarixi ərazisində meydana çıxmış, hazırda xalq sənətkarları, ustalar, rəssamlar tərəfindən əl ilə toxunan bu sənət nümunələrinin qorunub saxlanılması, öyrənilməsi, təbliği və inkişaf etdirilməsi ilə əlaqədar yaranan münasibətləri tənzimləyən Azərbaycan xalça sənətinin qorunması və inkişaf etdirilməsi haqqında Qanun müstəqillik illərində bu sahəyə göstərilən yüksək səviyyədə dövlət qayğısının ifadəsidir (07 dekabr 2004 -cü il).

*6

Xalçaçılıq Azərbaycan xalqının tarixində onun zəngin mənəvi aləmini, xarakterik xüsusiyyətlərini, formalaşan dünyagörüşünü, özünəməxsus intellektini, estetikasını, həyat fəlsəfəsini, dini görüşlərini, daxili düşüncə tərzini özündə əks etdirən incə bir sənət sahəsidir. İnsanın özünü anladığı, dərk etdiyi zamandan bu günə qədər istər kənd, istərsə də şəhər sakinləri xalı-xalça üstündə doğulmuş, yaşamış, dünyadan köçmüşlər. Danılmaz faktdır ki, xalça məmulatı həyatımızda heç bir zaman aktuallığını itirməyən, dəyişməz atribut olaraq qalmaqdadır.

Xalçalar öz tətbiqi təyinatına uyğun olaraq qədim zamanlardan harmonikliyi, ritmi, rənglərin gözəlliyini özündə əks etdirir. Lakin iqtisadi və coğrafi tələblərin birliyi əsas şərt idi ki, xalça sənətində bədii formalaşma estetik dəyər kəsb edərək, xalqın milli xüsusiyyətlərini və dəyərlərini özündə əks etdirən əsl sənətə çevrilsin. Əlbəttə ki, bu baxımdan Azərbaycan bütün bu dəyərləri özündə birləşdirə bilən bir diyardır. Bu mənada xalça sənətinin yaranması və inkişafı möhtəşəm bir tarixi dövrü əhatə edir.

Qədim zamanlardan bəri Azərbaycan xalçaları hərtərəfli tədqiq edilib öyrənilmişdir. Xalçalarımız haqqında məlumata ilk yunan alimi Ksenofontun əsərlərində rast gəlinir. Xalçalarımız haqqında qiymətli məlumatlara orta əsrlərdə Azərbaycana gəlmiş ərəb və İran tarixçilərinin, daha sonralar isə Avropa səyahətçilərinin yazılarında rast gəlinir. XIX əsrin sonlarında isə bir çox Avropa ölkələrində Şərq incəsənətinə həsr olunmuş kitab və albomlarda Azərbaycan xalçalarının bədii və texniki xüsusiyyətləri haqqında əsaslı məlumatlar verilmişdir.

Azərbaycan xalçaları artıq uzun illərdir ki, dünyanın bir çox ölkələrindən xalçaçı mütəxəssislərin diqqətini cəlb edir. Bu xalçaların toxunma və texnologiyası, süjet müxtəlifliyi, naxış və rəng həlli, kompozisiya quruluşu yeni tədqiqatlar üçün geniş imkanlar yaradır. Əsrlər boyu Azərbaycan xalçasında yaşanmış ənənələrin müasir xalçaçı-rəssamlar tərəfindən davam etdirilməsi, eləcə də yeni stilizə olunmuş elementlərin yaranması ilə üzə çıxır. Çünki xalça ədəbiyyat, memarlıq, miniatür rəngkarlığı və dekorativ-tətbiqi sənət sahələri ilə sıx şəkildə bağlıdır.

Səməd Vurğun Londonda olarkən, ziyafətlərin birində gözü yerə döşənmiş bu sənət nümunələrinə sataşdıqda, “mərmər döşəmələr üstə xalılar bəzisi hinddəndir, bəzisi Çindən”,- deyərkən bu sənət əsərlərinin Şərqə məxsus olduğuna işarə vurmuşdur. Sonra da ürək yanğısı ilə hind qızının “toxuduğu xalılar üstə lordların qol-qola verərək rəqs etdiklərini” qeyd etmişdir. Şair bu mənzərəni seyr edərkən Şərq-Azərbaycan xalçalarının dünyaya yayıldığından qürur duyur, oxucuların diqqətini orta əsrlər Şərqinin maddi və mənəvi mədəniyyətlərinin sonsuz hüdudlarına cəlb edir.

Bütün bunlar belə bir maddi-mənəvi sərvətlərin təhsilalanlara lap kiçik yaşlarından zəruriliyini məktəb qarşısında bir məqsəd kimi qoyur. Ümumtəhsil məktəblərində ibtidai siniflərdən başlayaraq şagirdləri milli sənət nümunələri olan xalçaçılıqla tanış etmək, onlarda bu sahəyə maraq yaratmaq son dərəcə vacibdir.

Ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumunda təsviri incəsənət fənninin vəzifələri müəyyənləşdirilərkən aşağıdakı cəhətlər də öz yerini tutmuşdur:

- Şagirdləri təsviri sənət növlərinin forma, janr, üslub və ifadə vasitələri, incəsənət tarixi haqqında ümumi məlumatlarla tanış etmək, onların yaradıcı estetik fəaliyyətlə bağlı ən sadə və ilkin bacarıqlara yiyələnmələrini təmin etmək;
- Şagirdlərdə bədii zövq, estetik mədəniyyət, rəng, forma və məkan hissiy-

yatı, vizual yaddaş, milli təsviri və dekorativ sənət növlərinə məhəbbət, ümumbəşəri incəsənət nümunələrinə, habelə bədii yaradıcılığa meyil və maraq formalaşdırmaq;

- Şagirdlərdə mücərrəd və məntiqi təfəkkür, əməksevərlik bacarıqları formalaşdırmaq (1, s.244).

İbtidai siniflərdə tədris olunan təsviri incəsənət fənninin konseptual tələblər baxımından vəzifələrinin reallaşdırılması şagird şəxsiyyətinin inkişafında əhəmiyyətli dərəcədə dəyişikliklərin baş verməsinə səbəb olur. Çox təəssüflər olsun ki, bu fənnin tədrisini peşəkarlıqla həyata keçirənlərin sayı hələ azdır.

Aparılan müşahidələr və təcrübələrdən aydın olur ki, ibtidai siniflərdən başlayaraq xalça üzərində şagirdlərin sadə təsviri fəaliyyəti onların fiziki, əqli və estetik inkişafına yüksək səviyyədə təsir göstərərək maraq formalaşdırır.

Tətbiqi sənətin xüsusi bir qolu olan xalçaçılıq Azərbaycan xalqının milli mədəniyyəti tarixində özünəməxsus yer tutur. Bu sənət növü, demək olar ki, Azərbaycan xalqının rəmzinə çevrilmişdir. Yüksək bədii dəyərə məxsus xalçalarımızın naxışları yaddaşda özünə əvəzolunmaz yer edən müxtəlif elementlər və fərqli təsvirlərlə bəzədilirdi.

Xalça sənətinin inkişaf tarixinə nəzər salsaq bu sənətin izlərinə əsrləri ötüb keçən uzaq bir keçmişdən baxmalı olarıq. Azərbaycanda istər mövcud təsərrüfat imkanı, istərsə də təbii şərait xalçaçılığın inkişafı üçün əlverişli olmuşdur: yun parça istehsalı üçün tükənməz bir mənbə olan qoyunçuluğun geniş yayılması, gözəl, zəngin təbii boyaların olması Azərbaycanda zərif xalçaçılıq sənətinin inkişafı üçün lazımi imkan yaratmışdır. Doğrudan da, "Təbiət quranda Azərbaycanı ona çəkilmişdir xilqətin əli (S.Vurğun).

Artıq məlum olduğu kimi, arxeoloji materiallar Azərbaycan xalça sənəti tarixinin çox keçmiş tarixə söykəndiyini sübut etmişdir. Bu haqda kifayət qədər araşdırmalar aparılmış, müxtəlif elmi yazılarda geniş izahatlar verilmişdir.

Azərbaycanda xalçaçılığın inkişafı haqqında Herodot, Klavdi Elian, Ksenofont və başqa qədim dünya tarixçilərinin əsərlərində önəmli məlumatlara rast gəlinir.

600-dən artıq kompozisiyası ilə bəzədilmiş Azərbaycan xalçaları sanki bu əzəmətli dünyanın salnaməsidir.

III-VII əsrlərdə Azərbaycanda xalça sənəti daha da inkişaf etməyə başladı. Bu dövrdə Azərbaycanda ipəkdən, qızıl-gümüş saplardan nəfis xalçalar toxunurdu.

Azərbaycan xalçalarının bədii, eləcə də texniki xüsusiyyətləri haqqında orta əsrlərə aid bir çox materiallar vardır. Məsələn, X əsrə aid "Dünyanın sərhədləri" əsərində Muğanda toxunulan palaz və çulları, Naxçıvanın zili toxunuşlu xalıları haqqında məlumat verilir. Bu yazının müəllifi, təəssüf ki, məlum deyil.

"Kitabi-Dədə Qorqud" dastanında, Nizami Gəncəvinin, Xaqanin və digər mütəfəkkirlərin, orta əsr yazarlarının əsərlərində Azərbaycanın ipək xalçalarına aid məlumatlarla rastlaşmaq mümkündür. Orta əsrlərdə Azərbaycandan xarici ölkələrə ixrac edilmiş xalçalar öz incə naxış elementləri, zərif və nəfis toxunuşları ilə məşhur Avropa rəssamlarının diqqətini cəlb etməyə başlayır. Bunu onların əsərlərində, miniatürlərində görmək mümkündür.

XVIII əsrin II yarısında Şimali Azərbaycanın Şəki, Bakı, Quba, Qarabağ, İrəvan, Gəncə, Naxçıvan, Şirvan kimi kiçik xanlıqlara bölünməsi ilə xalça istehsalı genişlənməyə başladı. O dövrdə adlarını çəkdiyimiz hər bir xanlığın özünə aid xalçaçılıq karxanası mövcud olmuşdur. Belə ki, xanlıqlar dövründə xalçaçılıq sənətinin inkişafı gələcəkdə bu istiqamətdə xalça məktəblərinin adının yaranmasına zəmin

yaratdı.

Azərbaycan xalçaları texniki baxımdan xovlu və xovsuz növlərə bölünür. Xovsuz xalçalar toxuculuq sənətinin, demək olar ki, ən erkən dövrünə təsadüf edir.

Azərbaycan xalçaları sənət sahəsi kimi naxış, kompozisiya, rəng həlli, texniki və bədii xüsusiyyətlərinə görə 7 xalçaçılıq məktəbinə (Bakı, yaxud Abşeron; Quba; Qarabağ; Şirvan; Gəncə; Qazax; Təbriz) bölünür.

Bakı xalçaçılıq məktəbi Görədil, Novxanı, Nardaran, Bülbülə, Fatmayı, Mərdəkan, Qala, Xilə və Abşeronun digər kəndlərini əhatə edir. Bura eyni zamanda Xızı rayonu, Qədi, Hil, Keş, Fındığan və digər xalça məntəqələri də aiddir. Bakı xalçaçılıq məktəbini digər məktəblərdən fərqləndirən xüsusiyyət bu xalçaların daha yumşaq olması, istifadə edilmiş rənglərin daha da intensivliyi, kompozisiyada istifadə edilmiş elementlərinin orijinallığı, ornamentlərinin zərifliyidir. Xalçaların üzərindəki təsvir edilmiş tarixi mənbələr, yazılar bu kəndlərdə xalçaçılığın geniş şəkildə inkişaf etdiyini, eyni zamanda bu xalça və xalça məmulatlarının ölkənin hüdudlarından kənara ixrac edildiyini də sübut edir. Xalçanın kompozisiyasında tez-tez rast gəlinən elementlərdən medalyonları qeyd etmək olar. Həmin element təbiətdə mövcud olan bitkilərdən alınmış ornamentlərin stilizə edilmiş, üslublaşdırılmış formaları üzərində qurulmuşdur.

Bu xalçaların bəzəklərində həndəsi formalı göllər, əyri xətli nəbati elementlər üstünlük təşkil edir. Bakı qrupuna aid xalçaların rəng koloritində ara sahənin yerliyində adətən tünd göy çalardan, bəzi hallarda isə qırmızı və sarı rənglərdən istifadə olunur. Bakı xalçalarının, demək olar ki, böyük əksəriyyəti toxunduğu kəndin adını daşıyır. Məsələn, “Novxanı”, ”Suraxanı”, “Qala”, “Görədil”, “Fatmayı”, “Fındığan”, “Qədi” və s.

Quba xalça mərkəzi üç hissəyə - dağlıq, dağətəyi və ovalıq hissələrə bölünür, Azərbaycanın şimal-şərqində yerləşir. Dağlıq hissədəki məntəqələr – Qırız, Qonaqkənd, Xaşi, Buduq, Cimi, Afurca, Yerfi, Cek, Salmasöyüd kəndlərində mərkəzləşmişdir.

Burada 30-dan çox ornament kompozisiyalı xalçaları əhatə edir. Quba ərazisi müxtəlif etnik qrupların, tayfaların yerləşdiyi tarixi bölgə olduğu üçün burada toxunmuş xalçalar da geniş naxış müxtəlifliyi ilə fərqlənirlər. Həmin xalçaların naxış elementlərinin, ornamentlərinin çox hissəsi stilizə olunmuş bitki motivləri ilə xarakterizə olunur. Bu xüsusiyyəti elə ilk baxışdan görmək mümkündür. Diqqətlə nəzər saldıqda kompozisiyanın bütün bəzəklərinin vahid bir sistem üzərində qurulduğunu görmək mümkündür.

Quba xalça istehsalının əsas mərkəzləşmiş hissəsi Əmirxanlı, Əlixanlı, Xəlfələr, Pirəmsan, Bilici, Şahnəzərli, Pirəbədil, Zeyvə, Zöhrami, Sumaqobaq, Xırdagül-çiçi, Sırt-çiçi, Dərə-çiçi kimi dağətəyi zonalara aid edilir. Şabran aran zonasında Çay Qaraqaşlı, Hacı Qaraqaşlı, Süsənli, Qaraqaşlı, Dəvəçi, Mollakamallı və digər kəndlərdə isə aralıq zonaya məxsus mərkəzləşmiş xalça istehsalı müəssisələri vardır ( 3, s. 23-24).

Quba xalçalarında, əsasən, həndəsi naxışlardan istifadə olunur. Bunlar stilizə edilmiş heyvan motivlərindən, çox zaman da təbiətdən götürülmüş bitki mənşəli elementlərdən, naxışlardan ibarət olur. Quba məktəbinə aid xalçaların kompozisiya quruluşunda medalyonlu çeşni üslubundan da geniş istifadə olunur. Bu məktəbin kompozisiyası sıralarında “Qədim-Minarə”, “Qımıl”, “Alpan”, “Qollu-çiçi”, “Pirəbədil”, “Hacıqayıb”, “Qırız” və digərlərinin adlarını çəkə bilərik.

Qarabağ xalça məktəbi dağlıq və

aran zonaları üzrə iki regionu əhatə edir. Dağlıq zonaya nisbətən xammalla, şübhəsiz ki, daha yaxşı təmin olunmuş aran rayonlarında Cəbrayıl, Ağdam, Bərdə və Füzuli xalça istehsalında əsas yer tutur. Qarabağ qrupu xalçalarının 33 kompozisiyası vardır.

Qarabağ xalçaları öz texnoloji xüsusiyyəti baxımından sıx hündür və yumşaq xova malik olması ilə fərqlənir. Bu xalçaların rəng koloriti olduqca şuxdur, parlaqdır.

Qarabağ xalçaçılıq məktəbi XVIII əsrdə Şuşada cəmlənmişdir. Bu dövrdə klassik çeşnili xalçalarla yanaşı, Rusiyadan, eləcə də Avropadan gətirilmiş məcməyi, ətirli sabun, çit və digər müxtəlif məişət əşyalarının üzərindən götürülmüş naxışlardan yeni xalça kompozisiyaları toxunurdu. Qarabağ xalçaları zəngin boyaq palitrası ilə diqqəti cəlb edir. Bu rənglər gözəl Qarabağ təbiətinin həssas rənglərinin ən incə çalarlarını özündə əks etdirir.

Qarabağ xalçaları süjet müxtəlifliyinə və bədii təfsirinə görə özünəməxsusluq yaradır. Həmin xalçalar üfüqi simmetriya prinsipi üzrə mövzunun dekorativ cəhətdən mənimsənilməsinin əsl xalq manerasında qurulmuşdur. İlk öncə Qarabağ xalçalarında gözoxşayan təsvirlərlə yanaşı, əsasən, ovçuluq süjetindən də istifadə edilirdisə, sonralar burada həmin süjetlərə marağın azaldığını görürük.

Dağlıq zonaya aid mərkəzin hər birində çoxsaylı kəndlər var ki, burada toxuculuqla məşğul olan əhali çoxluq təşkil edir. Burada toxunan xalçalar, əsasən, satış məqsədilə həyata keçirilir. Bədii xüsusiyyəti, texnologiyası, rəng seçimi nöqteyi-nəzərindən Zəngəzur və Naxçıvan xalça istehsalı mərkəzləri də Qarabağ xalça məktəbinə daxildirlər. “Aran”, “Bağçadagüllər”, “Balıq”, “Buynuz”, “Bərdə”,“Bəhmənli”, “Qarabağ”, “Qoca”,“Qasımuşağı”,“Ləmbərani”, “Muğan”, “Talış”, “Ləmpə”, “Malıbəyli”, “Xanqərvənd”, “Xanlıq”, “Xantirmə”, “Çələbi”, “Şabalıdbuta” və digər çeşnili xalça kompozisiyaları Qarabağ xalçaçılıq məktəbinin klassik nümunələrindəndir.

Xalçaçılıq məktəbləri arasında Şirvan xalçaçılıq məktəbinin özünəməxsus yeri vardır. Bu Şamaxı, Mərəzə, Ağsu, Kürdəmir, Qazıməmməd, Göyçay və eləcə də onların ətraf kəndlərini əhatə edir. Bu xalçalar da adət üzrə əsasən mövcud olduğu zonanın adını daşıyır. “Mərəzə”, “Qobustan”, “Şirvan”,“Kürdəmir”, “Şalyan”, “Şirəlibəy”, “Çuxanlı”, “Bico”, “Hacıqabul” və digər nümunələrin adlarını misal göstərə bilərik.

Şirvan xalçaları özünün zəngin, mürəkkəb naxışlı kompozisiyaları ilə məşhurdur. Bu xalçalar hələ orta əsrlər Avropa rəssamlarının əsərlərində tərənnüm edilirdi. Niderland rəssamı Hans Memlinq “Məryəm öz körpəsi ilə” əsərində “Şirvan” xalçasının təsvirini vermişdir.

Gəncə xalçaçılıq məktəbi Gəncə şəhəri və onun ətraf kəndlərində, Gədəbəy və Goranboy, Şəmkir, Samux rayonlarında mərkəzləşmişdir. Təbii ki, məktəbin mərkəzi Gəncə şəhəridir. Bildiyimiz kimi, Gəncə hələ erkən orta əsrlərdən ipək, yun parçaların, ipək xalçaların istehsal mərkəzi kimi tanınmışdır. Əsrlər boyu yüksək keyfiyyətli xalça istehsalı mərkəzi olan Gəncədə xüsusi xalça emalatxanaları olmuşdur. Gəncə xalçaçılıq məktəbinin xarakterik xüsusiyyəti onun ətraf rayonlarda mövcud olan xalçaçılıq sənətinə də öz xüsusi təsirini göstərməsidir.

Gəncə xalçaçılıq məktəbinə aid xalça kompozisiyaları sırasında “Gəncə”, “Qədim Gəncə”, “Gölkənd”, “Fəxralı”, “Çaykənd”, “Çaylı”, “Şadılı”, “Çıraqlı”, “Samux” və digərlərini misal göstərə bilərik.

Qazax xalçaçılıq məktəbinə Qazax, Gürcüstan ərazisindəki azərbaycanlıların yaşayış əraziləri və XX əsrin sonlarına qədər azərbaycanlıların yaşadığı Ermənistandakı

bəzi bölgələr aiddir. Bura Borçalı və Göyçə xalçaçılıq məktəbləri aiddir. Qazax xalça məntəqəsinə Qazax və onun ətraf kəndləri, o cümlədən Ağstafa və Tovuz rayonları daxildir.

Borçalı xalçaçılıq məktəbi Borçalı, Qarayazı, Qaraçöp, Qaçağan xalça məntəqələrində mərkəzləşmişdir.

Qazax qrupuna daxil olan çeşnilər sırasında "Şıxlı", "Borçalı", "Qaymaqlı", "Qaraqoyunlu", "Qarayazı", "Qaraçöp", "Qaçağan", "Dağkəsəmən", "Dəmirçilər", "Kəmərli", "Göyçəli", "Salahlı" və digərlərinin adlarını qeyd etmək olar (2, s.8-19).

Xalçaçılığın öyrədilməsi və tətbiqi də unudulmamalıdır. Rəssamlıq Akademiyasının xalçaçı-rəssam ixtisasının tədrisində əsas fənn "Layihələndirilmə"dir. Bu fənn tələbələrə xalçaçılıq məmulatlarının layihələndirilməsi üzrə təcrübi bacarıqların verilməsini, layihənin qurulması qanunlarını, hər bir halda tələbə qarşısında duran tapşırığın yaradıcılıq baxımından dərk edilməsinin öyrədilməsini nəzərdə tutur. Bu zaman tələbələrə hər xalça layihəsinin bir sənət əsəri olduğu və onun özünəməxsus üslubunun olması anlayışı aşılanır. Eyni zamanda klassik irsin əhəmiyyətinin izah edilməsi, onlardan düzgün istifadə etməklə qanunauyğunluqları açmaq haqqında məlumatları özündə cəmləşdirən kursun əsas məqsədi öyrənilmə ardıcıllığına uyğun olaraq, qarış (rapport) və onun sxematik quruluşu əsasında kiçik ölçülərdə layihələndirilməsi, "Butabəndlik", "Gölbəndlik", "Qupbabəndlik", "Ləcəktürünc", "Bəndi-rumi", "Kətəbəbəndlik", "Açma-yumma", "Riçəkbəndlik", "Qab-qabı", "İslimibəndlik", "Əfşan", "Bağçada güllər", "Atlı-itli", "Şah Abbası", "Xətai", "Ağaclı" kimi kompozisiyaların təyinetmə üsulu ilə kağız üzərində layihələndirilməsi və rənglənməsindən ibarətdir.

Kursun proqramına əsasən "Ləçəktürünc", "Xətai", "Vaq-vaqı" və "Ovçuluq" adlı kompozisiyaların qapalı kompozisiya quruluşu əsasında layihələndirilib işlənməsi tapşırıq kimi ortaya çıxmışdır. Bu sistemlə işlənmiş kompozisiyalara müəyyən konkret vəziyyətlərdə baxmaq və bunlardan ancaq o vəziyyətdə istifadə etmək olur. Tələbələrdə yaradıcılıq işinin gücləndirilməsi üçün bu üsul ən uğurlu vasitələrdən biri kimi təyin edilmişdir.

Akademik T.Bünyadovun Azərbaycan xalçaçılarının Qazax-Borçalı qrumuna dair son tədqiqlərində bu barədə daha çox müfəssəl məlumatlar vardır. Bu kitab Azərbaycan və dünya xalçaçılığına ən dəyərli hədiyyədir.

Xalça sənətində "Ləmpə" adlı üç dəst xalça kompozisiyalarının özünəməxsus yeri vardır. Keçmiş ənənələrdən fərqli olaraq "Ləmpə" kompozisiyasının quruluş qaydalarından istifadə etməklə çox müasir, dolğun və yeni üslubda kompozisiyalar yaratmaq mümkündür. Bu tipli kompozisiyalar ənənəvi olaraq üç dəstdən ibarət toxunmuşdur. Deməli, tədris zamanı tələbələr bu ənənəyə sadiq qalaraq, öz layihələrini üçlük (triptix) kompozisiya sistemində işləməlidirlər.

Nəticə olaraq qeyd etmək olar ki, digər kompozisiya sistemlərindən fərqli olaraq "Ləmpə" kompozisiya sistemi daha çox öyrənmək imkanı yaradır.

Kompozisiyanı üçlük əsasında işləmək, ayrı-ayrı formaların və bütövlükdə səthin traktovkasında konstruktivlik və demokratiklik prinsiplərini öyrənmək məqsədi daşıyır.

"Dörd fəsil" adlı xalça kompozisiyaları klassik Azərbaycan xalça sənətində özünəməxsus yer tutaraq inkişaf etmişdir. Öz fəlsəfi kökünü çox qədimlərdə götürmüş bu tipli kompozisiyaları öyrənmək və inkişaf etdirmək bugünkü xalçaçılıq sənətində də özünü göstərməkdədir.

"Dörd fəsil" və antropomorf tipli

süjetli xalça kompozisiyaları – ornamental süjetli xalçalar sisteminə daxildir. Bu sistemdə axtarışlar və kompozisiya qurmaq, digər sistemlərdən fərqli olaraq daha mürəkkəbdir.

Bu məqamda fənnin tələblərindən irəli gələrək Azərbaycan xalça ornamentinin qonşu xalqların xalça naxışları və süjetləri ilə yaxınlıq münasibəti və bu tipli kompozisiyalardan nümunələri ilə müqayisələr də aparıla bilər. "Dörd fəsil" xalçalarının haşiyələrinin asimmetrik olması, kompozisiyanın bədii quruluşuna zənginlik verməklə yanaşı, eyni zamanda haşiyə zolaqları üçün səciyyəvi olan element və naxışların formalaşdırılması prinsipi qoyur. Belə yanaşma tələbədə axtarışa və yenilikliyə münasibəti artırır.

Azərbaycan xalçaçılıq məktəblərində müxtəlif çeşiddə bu tipli xalça kompozisiyaları işlənib toxunmuşdur. Ənənəvi olaraq bu mövzuda kompozisiya yaratmaq və onun rəng münasibətlərini qoruyub, inkişaf etdirərək öyrənmək kursun əsas məqsədi hesab edilir.

Rəhbərlik etdiyim 13 nömrəli Bakı Peşə Məktəbində xalçaçılıq ixtisası üzrə tədris zamanı şagirdlərin öz layihələrini üçlük (triptix) kompozisiya sistemində işləmələri ilə bağlı texnoloji biliklərin aşılanması həmişə diqqət mərkəzindədir. Bu da şagirdlərin layihələndirmədə müasir texnoloji yanaşmalara münasibətini müəyyən edir. Onları sehrli bir aləm olan xalçaçılıq dünyasına qovuşdurur. Təhsilalanlar xalçaçılığa dair məlumatlara və bu sahədə peşəkarlığa yiyələnməklə həm də özlərində sənət duyumu tərbiyə edir, sənət problemləri aləminə vəsiqə alır, sənətin estetik mahiyyəti, onun dünəni, bu günü, xüsusən sabahkı taleyi barədə düşünür, mənəvi sərvətlərin qorunub saxlanmasında özünü məsul bilir.

*Rəyçi: dos. Ş.Ağayev*

## İstifadə edilmiş ədəbiyyat

**1. Ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumları. Bakı:Təhsil, 2008.**

**2. Səlimzadə S. Nağıl ilmələr. Bakı: Şirvannəşr, 2008.**

**3. Səlimzadə S., Nuriyev Ə. Xalçaçılıq texnologiyası. Bakı: Şərq-Qərb, 2011.**

**4. Əliyev A. Tikiş istehsalının texnologiyası. Bakı: Şərq-Qərb, 2011.**

**5. Bünyadov T. Qazax-Borçalı xalçaları. Bakı, 2014.**

**С.Салимзаде**

**Слово забота и сама забота**

**Резюме**

**В статье даётся информация об истории развития одного из видов национального богатства - ковроткачества, о формировании традиционных школ ковроткачества в отдельных регионах, о важности обучения этому искусству в соответствии с требованиями курикулума.**

**S.Salimzadeh**

**Care in words care in deed**

**Summary**

**The article is dedicated to the development of Azerbaijan's national wealth –carpet weaving and creating carpet-weaving schools. The importance of teaching this profession according to the requirements of curriculum, as well, as, state care in this mission is also noted.**



# FİZİKİ MƏDƏNİYYƏT ANLAYIŞLARININ SƏCİYYƏSİ BARƏDƏ

**Baloğlan Quliyev,**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti, pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** ***fiziki mədəniyyət, fiziki tərbiyə, idman, fiziki kamillik, fiziki kamilləşmə, fiziki bacarıq.***

***Ключевые слова:*** ***физическая культура, физическое воспитание, спорт, физическая зрелость, физическое совершенствование, физические умения.***

***Key words:*** ***physical culture, physical training, physical preparation, physical development, physical improve, physical ability.***

"Bədən tərbiyəsi", "Fiziki tərbiyə" və "İdman" anlayışları barədə müxtəlif mövqedən çıxış edən tədqiqatçı alimlər az deyildir. Bu mövqelərin bəziləri üst-üstə düşür, bəziləri müəyyən qədər fərqlənir, bəziləri isə bir-birindən tamamilə fərqlənir. Bu, təbii haldır. Çünki açıq etiraf olunmalıdır ki, anlayışların mahiyyət etibarilə fərqlərini aşkarlamaq çox vacib və maraqlı olduğu kimi, həm də mübahisəli məsələdir.

Anlayışlar arasındakı fərqi ayırd etmək məqsədi ilə 2 istiqamətdə tədqiqat aparılmışdır:

1) Elmi, pedaqoji-metodik ədəbiyyatın öyrənilməsi, təhlili və ümumiləşdirilməsi;

2) Sorğunun keçirilməsi, təhlili və qruplaşdırılması.

Sorğu bədən tərbiyəsi və idman mütəxəssisləri ilə aparılmışdır. Fikirlər müxtəlif olmuşdur. Həmin fikirləri təxminən aşağıdakı kimi qruplaşdırmaq mümkündür:

- anlayışlar arasında heç bir fərq yoxdur. Bunlar eyni olub, bir-biri ilə sinonimdir;
- anlayışlardan hər hansı birinə üstünlük verilir, birini geniş, digərlərini isə onun tərkibində görür, yəni dar mənada qəbul edirlər;
- bədən tərbiyəsi, fiziki tərbiyə və idman eyni miqyaslı pedaqoji prosesdir;
- bədən tərbiyəsi və ya fiziki tərbiyə pedaqoji proses kimi üstünlük təşkil edir;
- bədən tərbiyəsi pedaqoji anlayış deyildir. O, müəllim və ya məşqçinin rəhbərliyi altında aparılmaya da bilər;
- fiziki tərbiyə pedaqoji proses olub, bilavasitə müəllimin nəzarəti altında aparılır.

Nəhayət, suala cavab verməkdən çəkinənlər, yəni susanlar da olmuşdur.

Sorğuda iştirak edənlərin cavabı bir neçə kəlmə ilə başa çatmış, anlayışların əsaslandırılmış məntiqi izahı açıqlanmamışdır. Bu səbəbdən də xarici və ölkə alimlərinin tədqiqatlarına müraciət etməli oldum.

Xarici ölkə alimləri spesifik an-

layışlar haqqında. Yaxın xarici ölkələrin pedaqogika və fiziki tərbiyə üzrə elmi, pedaqoji-metodik ədəbiyyatında bu üç anlayış - bədən tərbiyəsi, fiziki tərbiyə, idman barədə məlumatlar mövcuddur. Rus pedaqoji-metodiki mənbələrində anlayışların şərhi onun mənasının izahı, əsasən, bir-birinə yaxın gəlməklə, həm də müəyyən dərəcədə fərqlənir.

“Fiziki tərbiyə” anlayışı XIX əsrin 2-ci yarısında iki mənada “geniş” və “dar” mənada işlədilməyə başlamışdır. Fiziki tərbiyə uşaq orqanizminə mütəşəkkil təsir göstərən proses kimi bütün orqanların düzgün inkişafına, onların funksiyalarının təkmilləşməsinə, fiziki qüvvələrin artmasına, mühitin zərərli təsirlərinin qarşısını almağa, müqavimətin artmasına və sağlamlığın möhkəmləndirilməsi məqsədinə yönəldilmişdir.

Fiziki tərbiyə nisbətən geniş mənada anlayış kimi Qərbi Avropa və ABŞ ölkələrində daha geniş yayılmış və digər anlayışlara nisbətən xeyli üstünlüyə malik olmuşdur. Bu sahədə fiziki inkişafa, sağlamlığın möhkəmləndirilməsinə və hərəktverici hazırlığa yiyələnmək başlıca şərtlərdən sayılmışdır. Bir sıra görkəmli tədqiqatçılar axırıncını psixikaya təsirlə - intellekt, iradə, emosiya, əxlaq və s. ilə sıx əlaqədar olduğunu göstərmişlər ( F.Laqrnaj, 1894; Q.Demeni, 1900, 1905, 1915 və b.).

Tarixə kiçik bir baxışdan göründüyü kimi, “fiziki tərbiyə” anlayışı XIX əsrdə oktyabr sosialist inqilabından xeyli əvvəl yaranmış, 1920-ci ildən isə “fiziçeskaya kultura” anlayışı ilə əvəz olunmuşdur. Daha doğrusu, “fiziki tərbiyə” anlayışı ədəbiyyatda və danışıqda az-az işlənməyə başlamış və onun mövqeyi tədricən zəifləmişdir. Doğrudur, həmin illərdə “телесное воспитание” (bədən tərbiyəsi) anlayışına da rast gəlsək də, o, mahiyyətcə “физическая культура” – (fiziki mədəniyyət) anlayışının alternativi olmamışdır. Ədəbi-mədəni dilimizdə “физическая культура” - fiziki mədəniyyət deyil, “телесное воспитание” – bədən tərbiyəsi dərin kök salmış və bu gün də işlənməkdədir.

Böyük rus pedaqoqu P.F.Lesqaft “məktəbyaşlı uşaqların fiziki təhsilinə rəhbərlik” adlı çox qiymətli əsərində ilk dəfə olaraq “Fiziki təhsil” terminini işlətməklə, həm də fiziki təhsil nəzəriyyəsini yaratmışdır.

Lesqaftın fiziki təhsil nəzəriyyəsinin davametdiricisi V.V.Qorinevski (1913) fiziki inkişafı yaxşılaşdırmaq və hərəki (fiziki) keyfiyyətləri təkmilləşdirmək məqsədi ilə xüsusi olaraq mütəşəkkil surətdə təşkil edilmiş orqanizmin forma və funksiyalarına təsir göstərilməsini fiziki təhsil ilə əlaqələndirmişdir.

A.D.Butovski 1913-cü ildə Lesqaftın ideyalarına istinad edərək yazır ki, fiziki təhsil dedikdə, hərəkət koordinasiyasının təkmilləşməsi və hər bir adam üçün zəruri olan ümumi fiziki hərəkət vərdişlərinin qazanılması başa düşülür. Bu vaxt fiziki təhsil prosesi fiziki inkişafın düzgün getməsinə, fizioloji cəhətdən orqanizm üçün faydalı olmasına kömək göstərməli, insan psixikasına - əqli inkişafa, möhkəm iradənin və emosiyanın yaranmasına müsbət təsir etməlidir.

Q.Dyuperron hələ 1925-ci ildə fiziki təhsili yalnız fiziki tərbiyə prosesində qazanılmış “bədən keyfiyyətləri”nin şüurlu məqsədəuyğun istifadə edilməsinə yiyələnmək incəsənəti kimi qiymətləndirmişdir. Demək, əgər P.F.Lesqaft, onun arxasınca V.V.Qorinevski və A.D.Butovski fiziki təhsil fikrinə sözün geniş mənasında fiziki tərbiyənin bütöv bir sistemi kimi baxırlarsa, digər mənada isə onu bu sistemin tərkib hissələrindən biri hesab edirlər.

V.E.İqnatyev 1927-ci ildə qeyd edirdi ki, bədən tərbiyəsi fiziki hərəkətləri kifayət qədər özündə cəmləşdirə bilmədiyi

halda o, gigiyena və sanitariyanın əsaslarını bir o qədər dərindən həyata keçirir və mənimsədir".

1930-cu illərdə isə demək olar ki, "Fiziki tərbiyə" və "Fiziki təhsil" anlayışları tamamilə unudulur. Tədris-tərbiyə işlərinin təkmilləşdirilməsinə, xüsusən: 1) Gigiyenik vəzifələrin (sağlamlıq) həyata keçirilməsinə diqqət artırılır; 2) Təhsil vəzifələrinə xüsusi fikir verilir ki, buraya əsas hərəkətlərə yiyələnmək, ümumi koordinasiyanın inkişafı, hərəki bacarıq və vərdişlərin formalaşdırılması və hərəki fəaliyyət üzrə zəruri biliklərin mənimsədilməsi daxildir.

M.N.Skatkin məktəb təhsilinin məzmununun bütöv bir sistem olduğunu şərh edərək göstərir ki, ...bilik, bacarıq və vərdişlərə yiyələnmək məktəblilərin əqli və fiziki qabiliyyətlərinin inkişafını təmin edir ... dünyagörüşünün və mənəviyyatının əsaslarını, habelə müvafiq davranışları formalaşdırır, onları həyata və əməyə hazırlayır".

N.V.Savin "Teoriya i metodika fiziçeskoqo vospitaniya" (T.İ.M., "Fizkultura i sport", 1967) dərsliyinə istinad edərək yazır ki, fiziki tərbiyə - pedaqoji proses olub, insan orqanizminin morfoloji və funksional təkmilləşməsinə, həyat üçün vacib əsas hərəki bacarıqların, onlarla əlaqədar biliklərin formalaşmasına və yaxşılaşmasına istiqamətləndirilmişdir". Bədən tərbiyəsi ümumi mədəniyyətin bir hissəsi olub, əhalinin fiziki cəhətdən təkmilləşməsinin xüsusi vasitəsi və onlardan istifadə işində cəmiyyətin əldə etmiş olduğu nailiyyətlərin məcmuidir".

V.N.Semenov yazır ki, fiziki tərbiyə-şəxsiyyətin hərtərəfli inkişafının komponenti və kommunist tərbiyəsinin mühüm vasitəsidir.

Bədən tərbiyə institutları üçün dərslikdə göstərilir: Fiziki tərbiyə dedikdə pedaqoji proses başa düşülür ki, bunun mahiyyətinə insanın fiziki inkişafının və onun fiziki təhsilinin idarə olunması daxildir". Fiziki tərbiyə ümumpedaqoji prosesin bir hissəsidir. Onun təyinatı adamları fiziki cəhətdən tərbiyə etməklə yanaşı, yaşlı nəslin bədən tərbiyəsi və idman sahəsində toplanmış bilik, bacarıq və vərdişlərini gənc nəslə verməkdən ibarətdir".

İ.A.Kryaçko spesifik anlayışlara xüsusi əhəmiyyət verir və "Fiziçeskaya kultura" adlı elmi-kütləvi kitabında bədən tərbiyəsi nə deməkdir sualına belə cavab verir: "Bədən tərbiyəsi - insanların sağlamlığında və tərbiyəsində güclü vasitədir". İdmana marağın daha dərin və daha möhkəm olması heç də başa düşmək çətin deyildir ki, bədən tərbiyəsi haqqında düzgün təsəvvürə yiyələnmək nəticəsində ola bilər. Bəzən onu ayrı-ayrı fiziki hərəkətlərlə, futbol, üzgüçülük və i.a. idman növləri ilə eyniləşdirir və ya qarışdırırlar.

İ.A.Kryaçko bədən tərbiyəsi anlayışını, onun mahiyyətini daha da konkretləşdirmək məqsədi ilə yazır ki, sovet dövləti şəraitində bədən tərbiyəsi sosialist mədəniyyəti kimi bütövlükdə öz ölkəsinin maddi rifahı naminə əmək məhsuldarlığının yüksəldilməsi kimi xeyirxah məqsədlər güdür. Bədən tərbiyəsi geniş mənada insanlara, həm də onların hərtərəfli fiziki inkişafına və mənəvi qabiliyyətlərinə qayğıdır.

"Teoriya fiziçeskoqo vospitaniya" adlı dərs vəsaitində deyilir: "Fiziki tərbiyə mütəşəkkil pedaqoji təsirlər sistemi kimi adamların fiziki inkişaf qabiliyyətlərini, onun orqanizminin morfoloji və funksional baxımdan təkmilləşdirilməsinin təsirlər sistemini təmin edir".

A.İ.Borisov qeyd edir ki, fiziki tərbiyə - ümumi tərbiyənin tərkib hissəsidir. O, tarixi xarakter, sinfi cəmiyyətdə isə sinfi xarakter daşıyır. Fiziki tərbiyə - ictimai hadisə kimi maddi həyat şəraitinin inkişafı ilə əlaqədar yaranır və inkişaf edir, cəmiyyətin tələbatına uyğun adamların fiziki

və mənəvi inkişafını təmin edir, onları əməyə və müdafiə fəaliyyətinə hazırlayır.

V.V.Stolbov və İ.Q.Çuqunov bədən tərbiyəsinin tarixinə həsr edilmiş dərsliyində bədən tərbiyəsi anlayışını belə izah edir: Bədən tərbiyəsi – bu ümumi mədəniyyətin bir hissəsi olub, xalqın fiziki təkmilləşməsinin xüsusi vasitələrinin yaranmasında cəmiyyətin nailiyyətlərinin məcmuyu kimi ondan istifadə edir".

Q.N.Satirov bədən tərbiyəsi dərslərində fiziki təhsil vəzifələrinin həyata keçirilməsindən danışarkən qeyd edir ki, hər şeydən əvvəl, "fiziki təhsil" və "fiziki tərbiyə" anlayışları və onların arasındakı fərqləri aydınlaşdırmalıdır. O, həmin məqsədlə yazır: "Fiziki tərbiyə məktəbdə pedaqoji proses kimi təlim və sanitariya-gigiyena normalarını gözləmək məqsədi ilə uşaq və yeniyetmələrə spesifik təsir göstərməyə, həyat tərzi fəaliyyətinə - fəal hərəki rejimə, həmçinin etik və estetik normalara cavab verə biləcək gündəlik icra olunan hərəkət və davranışlara istiqamətləndirilir".

Görkəmli macar tarixçisi L.Kun bədən tərbiyəsi və idmanın tarixini maraqlı və cəlbedici elm adlandırır. O yazır ki, tarix bədən tərbiyəsi və idmana bütün insan mədəniyyətinin ayrılmaz tərkib hissəsi, adamlara tərbiyə və təhsil verən, onları əməyə və hərbi fəaliyyətə hazırlayan vasitə kimi baxır.

M.M.Mehdizadə anlayışlar haqqında demişdir: "Fiziki tərbiyənin bədən tərbiyəsi ilə sıx əlaqəsi var və ona müsbət təsir göstərir. İncəlik, çeviklik, ahəngdar hərəkətlər, zahiri gözəllik və s. fiziki mədəniyyətin nəticəsindədir".

M.Ə.Muradxanovun rəhbərliyi altında nəşr olunmuş "Pedaqogika" dərsliyində fiziki tərbiyənin tərbiyənin tərkib hissəsi kimi şagirdlərin bədəncə sağlamlığını möhkəmləndirməyə, ahəngdar və normal inkişafına xidmət etməkdən ibarət olduğu qeyd edilir.

B.A.Əhmədov fiziki tərbiyə üzrə müvafiq ədəbiyyatı təhlil etdikdə müxtəlif vaxtlarda mətbuatda üç dəfə çıxış etmiş və gəlmiş olduğu qənaət bunlardır:

- Fiziki tərbiyə, doğrudan da, sırf pedaqoji anlayışdır və müəllimin (tərbiyəçinin) rəhbərliyi altında şagirdlərin (tələbələrin) fiziki cəhətdən formalaşmasına xidmət edir.

- idman fiziki mədəniyyətin tərkibinə daxildir. Fiziki tərbiyənin isə vasitələrindən biri kimi çıxış edir. O anlayışları aşağıdakı kimi səciyyələndirmişdir:

- fiziki mədəniyyət – cəmiyyətin ümumi mədəniyyətinin tərkib hissələrindən biri olub, insanın öz sağlamlığını möhkəmləndirməsi, fiziki qabiliyyətlərini inkişaf etdirməsi, çevik və gümrah böyüməsi üçün tarix boyu əldə edilmiş nailiyyətlərin məcmuyunu ifadə edir.

- fiziki tərbiyə - müəllimin rəhbərliyi altında şagirdlərin öz sağlamlığını möhkəmləndirməsi, çevikliyini və gümrahlığını təmin etmək prosesidir.

- fiziki inkişaf – istər fiziki tərbiyə prosesində, istərsə də kənar təsirlərin sayəsində orqanizmin morfoloji funksiyasının fiziki keyfiyyət və qabiliyyətlərini dəyişməsi, formalaşması prosesidir.

- fiziki kamillik – isə şəxsiyyətin fəaliyyətə (əməyə, təlimə və s.) fiziki cəhətdən hazır olması zəruriliyi ilə şərtləndirilən fiziki inkişaf səviyyəsini əks etdirir. Başqa sözlə desək, fiziki kamillik – cəmiyyətin konkret tarixi dövrdə əldə etdiyi fiziki mədəniyyətlə şəxsiyyətin həmin mədəniyyətə optimal yiyələnməsi arasındakı nisbəti ifadə edir.

N.M.Kazımov fiziki tərbiyəni tərbiyənin əsas tərkib hissəsi hesab edərək yazır ki, onu səciyyələndirən xüsusiyyətlərdən biri də fiziki tərbiyənin ideyallığıdır, ideya-siyasi tərbiyəyə, əxlaq tərbiyəsinə xidmət etməsidir.

Y.R.Talıbov, Ə.A.Ağayev və başqa

kollektiv müəlliflərin hazırlamış olduğu dərs vəsaitində göstərilir ki, fiziki tərbiyə məqsədyönlü, planlı və mütəşəkkil proses olub, gənc nəslin can sağlığını təmin etməyə, onun fiziki qabiliyyətlərini inkişaf etdirməyə, mütəhərrik vərdişlərin və bacarıqların formalaşmasına xidmət edir....

F.A.Rüstəmov demişdir: "...fiziki tərbiyə gənc nəslin fiziki və mənəvi cəhətdən sağlam böyüməsinə təsir göstərir, onların qıvraq, möhkəm bədənli, çətinliyə dözümlü, cəsarətli, iradəli, şən və gümrah adamlar kimi böyüməsinə kömək edir, onları ictimai-faydalı əməyə, vətənin müdafiəsinə hazırlayır" (1).

M.Ə.Nəsrullayev spesifik anlayışları təhlil etdikdən sonra yekun nəticə olaraq qeyd edir: "...bədən tərbiyəsi cəmiyyətin, böyüməkdə olan yaşlı nəslin fiziki iş qabiliyyətinin inkişafına yönəlmiş xüsusi vasitə, metod və şərtlərin yaradılması sahəsində nailiyyətlərinin cəmini göstərir. Fiziki tərbiyə öz təbiəti etibarilə pedaqoji proses olub, özünün pedaqoji prosesə xas olan bütün ümumi əlamətləri ilə insanın hərəki vərdişlərinin məqsədyönlü formalaşması və fiziki keyfiyyətlərinin inkişafınıı təmin edir" (2).

M.Quliyeva və A.Şükürov "Şəxsiyyətin fiziki kamilliyi və cəmiyyət" adlı məqaləsində yazır: "Fiziki kamillik dedikdə adamların tarixən şərtlənmiş hərtərəfli fiziki inkişafı, istehsal, məişət, hərbi müdafiə vəzifələrinə hazırlıq, yüksək qabiliyyət, uzun ömür sürmək üçün bacarıq nəzərdə tutulur".

Y.R.Talıbov və H.H.Qurbanov anlayışlara öz münasibətlərini belə bildirirlər: Bədən tərbiyəsi və idman tədricən formalaşan ümumbəşər mədəniyyətinin əsasını təşkil etməklə həmin mədəniyyətin tərkib hissəsinə çevrilirdi.

Anlayışların inteqrativ səciyyə daşıması (bir-biri ilə bağlı olması) onlara təhsilin yeni tələbləri baxımından yanaşmağı zəruri edir. Elmi-pedaqoji ədəbiyyatın təhlilinə və təcrübəmizə əsaslanaraq anlayışlara dair gəldiyimiz qənaət bunlardır:

Bədən tərbiyəsi – cəmiyyətin məqsəd və vəzifələrinin həyata keçirilməsinə uyğun olan insan mədəniyyətinin tərkib hissəsi kimi ən geniş anlayış olub, ictimai-sosial hadisədir. Mədəniyyət sözün geniş mənasında insan əməyi ilə yaradılan bəhrələnməli hər nə varsa, hamısını özündə birləşdirir. Fiziki mədəniyyət, eləcə də mühüm hərəki vasitə və metodlar sahəsində toplanmış təcrübəni adamların fiziki tərbiyə, fiziki inkişaf, fiziki təhsil və fiziki kamillik yönəmində tətbiq etməklə onların inkişafına və şəxsiyyət kimi hərtərəfli və ahəngdar təkmilləşməsinə və formalaşmasına müsbət təsir göstərir. O, eyni zamanda cəmiyyətin üzvlərinin mürəkkəb və bütöv bir fiziki mədəniyyət sistemi olmuş və olmaqda davam edir.

Fiziki tərbiyə - tərbiyənin tərkib hissəsi olmaqla, fiziki hərəkətlərin, təbii amillərin və gigiyena tədbirlərinin köməyi ilə fiziki inkişafı, fiziki hazırlığı və s. təlimini idarəetmə prosesidir. O, tədris-pedaqoji anlayışlar sırasına daxil olub, mütəşəkkil pedaqoji proses kimi müəllim-tərbiyəçi və valideynlərin rəhbərliyi və nəzarəti altında uşaqların bilavasitə iştirakı ilə cəmiyyətin tələbatına müvafiq dərs-məşğələ formasında həyata keçirilir. Fiziki tərbiyə şagirdlərin (tələbələrin) və uşaqların hərtərəfli və ahəngdar inkişafına müsbət təsir göstərməklə, onların fiziki cəhətdən normal inkişafına, fiziki təhsilinə, onun düzgün idarə edilməsinə yönəldilir.

Fiziki təhsil - mütəşəkkil təşkili prosesi olub, fiziki tərbiyənin tərkib hissəsi kimi geniş mənada başa düşülür və məşğul olanların fiziki bacarıq və vərdişləri üzrə xüsusi biliklərə yiyələnməsinə yönəldilmişdir. Həmin biliklər isə insanların fiziki inkişafına və hərəki keyfiyyətlərinin təkmilləşməsinə sə-

bəb olur.

Fiziki inkişaf - həyat şəraiti və tərbiyənin təsiri altında insan orqanizminin forma və funksiyalarının keyfiyyət və kəmiyyətcə dəyişməsi, fiziki qabiliyyət və keyfiyyətlərin inkişaf prosesidir.

Fiziki hazırlıq - fiziki bacarıq, vərdiş və fiziki keyfiyyətlərin inkişaf səviyyəsi ilə təyin edilir. Fiziki hazırlıq “Vətənin müdafiəsinə hazıram” bədən tərbiyəsi kompleksinin normotivləri əsasında müəyyən edilir.

İdman - fiziki tərbiyənin başlıca vasitəsi olub, fiziki mədəniyyətin ayrılmaz hissəsi kimi hərəki fəaliyyətin elə bir növüdür ki, insan bu fəaliyyət üzrə şəxsi və ictimai quruluşun mənafeyinə uyğun yüksək idman göstəriciləri qazanır.

Fiziki kamillik - dərin psixoloji, fizioloji və fiziki proses kimi sağlamlığın möhkəmləndirilməsinə, bədən münasibliyinə, üzvlər və sistemlərin ahəngdar inkişafına, təbii amillər və fiziki vasitələrə nail olma kimi başa düşülür. Bu mənəvi, əxlaqi və yüksək estetik zövq ehtiyacı şüurlu surətdə dərk etməklə həmin komponentləri vəhdət halında götürmək yolu ilə şəxsiyyətin hərəki qabiliyyət və keyfiyyətlərinin əməyə, təlimə, müdafiəyə və intellektual səviyyədə fiziki cəhətdən hazırlanması ilə şərtlənir. Fiziki kamilləşmə şəxsiyyətin ümumi mədəniyyətində özünü onun ayrılmaz tərkib hissəsi kimi göstərən fiziki mədəniyyətin nə dərəcədə mənimsənilməsi səviyyəsini əks etdirir (4).

*Rəyçilər: prof. M. İlyasov və prof. Ə.Mehdiyev*

## İstifadə edilmiş ədəbiyyat

**1. Rüstəmov F. Azərbaycanda təhsil və tərbiyə nəzəriyyəsinin inkişafı (1961-1981-ci illər). Bakı: Elm və təhsil, 2011.**

**2. Nəsrullayev M. Məktəblilərin fiziki tərbiyəsi. Dərs vəsaiti. Bakı, 2003.**

**3. Quliyev D. Azərbaycan idmanı müstəqillik illərində (1991-2012). Bakı: Təknur, 2013, 528 s.**

**4. Quliyev B. Fiziki tərbiyənin nəzəri-metodik və praktik işlərinin əsasları (Dərs vəsaiti). Bakı: ADPU, 2010, 660 s.**

**5. Милонов С., Кучеривенко А. Свободное пространство физической культуры. Народное образование, 2015, № 2.**

**Б.Кулиев**

**Характеристика понятий физической культуры**

**Резюме**

**В статье отмечается необходимость понятий “Физическая культура”, “Физическое воспитание”, “Спорт” и др. в учебном процессе. А также исследуются и анализируются высказывания иностранных и азербайджанских педагогов-ученых о сущности, целах и задачах и специфических терминах начиная со 2-ой половины XX века по настоящее время. Раскрываются и конкретизируются различные термины, соответствующие новым требованиям образования.**

**B. Guliyev**

**Concept of physical culture**

**Summary**

**This article deals with the necessity of physical cultural comprehensions in teaching process. The thoughts of foreign an Azerbaijan pedagogue-scientists are explained about the aim, duty and essence of physical culturel comprehensions from the 2nd half of XIX century to this time. Nevertheless according new require of education essence, aim and duty of spesific comprehensions are determined and concretized.**



# MÜTALİƏ MƏDƏNİYYƏTİNİN FORMALAŞDIRILMASI

**Aidə Hüseynova,**
***Hacıqabul rayonu, A.Dadaşov adına 5 nömrəli tam orta məktəbin müəllimi***

Mütaliə mədəniyyətinin formalaşdırılması və inkişafı baxımdan məktəbin üzərinə böyük məsuliyyət düşür. Onun istiqamətləndirilməsi ən prioritet vəzifələrdəndir. Azərbaycan Respublikası təhsil nazirinin "Ümumtəhsil məktəbi şagirdlərinin mütaliə vərdişlərinin təkmilləşdirilməsi və onlarda mütaliə mədəniyyətinin formalaşdırılması ilə bağlı tədbirlər barədə 16 dekabr 2014-cü il tarixli əmrin icrası ilə əlaqədar olaraq, Hacıqabul RTŞ-də müvafiq tədbirlər planı hazırlanmış və rayonun bütün məktəblərində əməli işlər həyata keçirilməyə başlanılmışdır. Dadaşov adına 5 nömrəli tam orta məktəbdə də bu istiqamətdə tədbirlərə start verilmişdir. Həqiqətən, son vaxtlar əhalinin əksər hissəsində kitab oxumaq meyli zəifləmişdir. Vaxt məhdudiyyəti, çoxsaylı telekanallarda nümayiş etdirilən əyləncə xarakterli zövqsüz şou-proqramların bolluğu, internet klubların cəlbediciliyi, gənc və yeniyetmələrin kompyuter oyunlarına, mobil telefonlara maraq göstərməsi onları kitabdan uzaqlaşdırır. Məşhur filosof Siseronun: "Kitab olmayan ev ruhdan ayrılan bədən kimidir" bənzətməsi təsadüfi deyil. Evdə valideynlərinin, məktəbdə yaşıdlarının, ətrafındakı yaxınlarının kitab oxumadığını görən şagird, təbii ki, hər hansı əsəri əldə edib oxumaq arzusunda olmaz. Amma bədii əsər oxumayan, müasir və klassik ədiblərimizi və onların yaratdıqları sənət incilərini tanımayan, dünya ədəbi-bədii irsindən bixəbər insan heç vaxt müasir, sivil, mədəni şəxs kimi yetişə bilməz.

Təhsil naziri cənab Mikayıl Cabbarov bu məsələyə dəfələrlə toxunmuş, mütaliənin əvəzsiz rolunu dönə-dönə qeyd etmişdir.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin "Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında" sərəncamı ilə çoxsaylı əsərlər təkrar nəşr olunmuş və ölkə kitabxanalarına hədiyyə edilmişdir. Artıq respublikamızda Azərbaycan və dünya ədəbiyyatı kitabxanaları seriyasından klassik və müasir yazıçıların əsərləri çap olunmuş, elektron kitabxanalar yaradılmışdır. Bu gün istənilən əsəri tapmaq və oxumaq mümkündür. Əsas odur ki, insanda oxumaq istəyi, mütaliə həvəsi olsun. Ona görə ümumtəhsil məktəblərində şagirdlərin mütaliəyə istiqamətləndirilməsi, onlarda mütaliə mədəniyyətinin formalaşdırılması üzrə zəruri tədbirlərin həyata keçirilməsi günün təxirəsalınmaz vəzifələrindəndir. Mütaliə mədəniyyətinin və oxuya motivasiyanın yüksəldilməsinə tək ədəbiyyat müəllimlərinin deyil, bütün məktəb kollektivinin, sinif rəhbərlərinin, kitabxanaçının birgə, səmərəli fəaliyyəti nəticəsində nail olmaq mümkündür. Valideynlər arasında da təbliğat və maarifləndirmə işlərinin aparılması, zənnimcə, müsbət nəticə verər. Onların şəxsi nümunəsi övladlarının oxuya motivasiyasını gücləndirər. Kiçik yaşlarından, ibtidai siniflərdə artıq şagirdə mütaliə mədəniyyəti

aşılanmalıdır. Məktəbimizin geniş, təmirli, gözoxşayan kitabxanası var. Kitabxanaçı Pərvanə Əliyeva burada səliqə-sahman yaradıb. Şagirdlərdə mütaliə mədəniyyətini formalaşdırmaq məqsədi ilə əvvəlcə onlarda kitaba, bədii ədəbiyyata sevgi hissi yaratmaq və inkişaf etdirmək lazımdır. Dahi Nizami Gəncəvinin zəngin dühasının, ustad qələminin məhsulu olan misralar köməyimizə yetir:

Dünyada nə qədər kitab var belə,
Çalışıb, əlləşib gətirdim ələ,
Oxudum, oxudum, sonra da vardım,
Hər gizli xəznədən bir dürr çıxardım.

Azərbaycan ən qədim zamanlardan nəhəng söz ustadlarının, bədii və fəlsəfi təxəyyül sahiblərinin məskəni kimi məşhur olub. Şagirdlərimizi onlardan yadigar qalan əsərlərlə tanış etməyi qarşımıza məqsəd qoymuşuq. Bu zaman şagirdlərin yaş və qavrama xüsusiyyətləri, psixoloji vəziyyətləri də nəzərə alınaraq, oxunması tövsiyə olunan əsərlərin siyahısını hazırlamışıq. Bədii ədəbiyyat insanın bədii zövqünü cilalayır, onun mənən zənginləşməsində, kamil şəxsiyyət kimi yetişməsində əhəmiyyətli rol oynayır. Biz tədbirlər planına humanizmi, xeyirxahlığı, xalqa bağlılığı, vətənpərvərliyi, dövlətçiliyə sədaqəti aşılayan əsərlərlə yanaşı, şifahi xalq ədəbiyyatı nümunələri də daxil etmişik.

Müvafiq göstərişlərə uyğun olaraq ümumtəhsil məktəblərində məşhur yazıçıların, ədəbiyyat sahəsində Nobel mükafatına layiq görülmüş yazıçıların, eləcə də tanınmış Azərbaycan ədiblərinin yaradıcılığı və əsərlərinin məzmunu haqqında şagirdlərə məlumatlar çatdırılmalıdır. Artıq bu istiqamətdə xeyli iş görülmüşdür. Bu günlərdə görkəmli qırğız yazıçısı Çingiz Aytmatovun “Əsrə bərabər gün” romanı şagirdlərimiz tərəfindən oxunmuş və müzakirə olunmuşdur. Kiçik yaşlı şagirdlərimizə Nobel mükafatı laureatı Redyard Kiplinqin əsərlərini oxumaq tövsiyə olunur. Onun əsəri əsasında çəkilmiş “Mauqli” cizgi filmi birgə izlənilmişdir. Yuxarı sinif şagirdlərinə isə Nobel mükafatı laureatı Ernest Heminqueyin “Əlvida, silah!” romanını oxumaq, roman haqqında rəylərini yazmaq tapşırığı verilmişdir. Sonra əsər müzakirə olunmuşdur.

Gözəl müəllim və yazıçı S.S.Axundovun “Qorxulu nağıllar”ına altıncı və yeddinci sinif şagirdləri həmişə maraq göstərmişlər. A.Şaiqin, B.Vahabzadənin, Z.Yaqubun əsərləri mütaliə və müzakirə olunmaq üçün şagirdlərin ixtiyarına verilmişdir. Sürətli oxu müsabiqəsi keçirilmiş, bədii əsərlər əsasında lentə alınmış ekran əsərlərinə kollektiv baxış keçirilir. Ədəbi-bədii qiraət gecələri, “Ən fəal oxucu”, “Bədii əsər haqqında ən yaxşı inşa”, “Bədii əsər barədə ən mükəmməl rəy” müsabiqələri ədəbi-bədii hekayə axşamları da uşaqların mütaliə mədəniyyətinə kömək edir.

Kitaba, mütaliəyə maraq oyatmaq üçün bu barədə deyilən müdrik sözlər də yada salınır: “Kitab - bir kəsin o biri kəsə mənəvi vəsiyyətidir” (A.Gertsen), “Kitab insan ruhunun müqəddəs yazısıdır” (M.Qorki). Uşaqlara oxumağın vacibliyi də çatdırılmalıdır. P.Stil yazmışdır ki, “İdman bədən üçün, oxumaq isə ağıl üçün lazımdır.”

Uşaqlara mütaliənin səmərəliliyi də izah edilməlidir. Mütaliəyə həvəs oyatmaq, heç də hər cür əsəri, yaxud internetdə qoyulan hər cür məlumatı oxumaq, öyrənmək demək deyildir. Onlar oxumaq üçün əsərləri müəllimin rəhbərliyi ilə seçməli və ancaq tövsiyə olunanları oxumalıdırlar. Mütaliə - tərbiyənin ən etibarlı açarıdır.

